AcademyGate Publishing
p-ISSN 2790-0029; e-ISSN 2790-0037

# ISLAM'S CONTRIBUTION TO SCIENCE IN EUROPE (AS DESCRIBED BY WESTERN SCHOLARS)

**Tarlan Seyfullayev**[1]

**UDC:** 297.
**LBC:** 86.38
**HoS:** 40
**DOI:** 10.33864/2790-0037.2024.v5.i4.59-81

**Keywords:**

Islam
Europe
Science
Medicine
Hygiene

## ABSTRACT

According to the explicit admission of Western historians, Europe's scientific movement was inspired by the scientific movement of Muslims, and Europeans owe their scientific advancements to Islamic scholars! Based on the admissions of Western scholars, "When we consider the contributions of Muslims to Western culture, we see that science illuminated the West from the East!" Dr. Max Meyerhof states: "Muslim science was like the shining moon that illuminated the darkest nights of medieval Europe. As new sciences emerged, the moon faded in color, but it was that same moon that guided us through the dark nights to where we are now. We can say that its rays are still with us!" In the same book, we read: "In short, with the translation of Muslim scholars' books, Europe's barren land was blessed with rainfall, making it fertile, and gradually Europeans became acquainted with Eastern sciences!" He writes: "Recent discoveries have shed new light on the ancient history of Islamic world sciences, but it must be admitted that these discoveries are still insufficient; the world will increasingly realize the significance of Islamic sciences in the future." Professor Gibb writes: "Looking back at the past, we see that the science and literature of the East acted like leavening for Western civilization, in such a way that the influence of Eastern spirit and thought illuminated the dark minds of people in past centuries in the West and led them to a broader world!" The famous Christian historian George Zaidan writes: "When Islamic civilization reached its full stage and foreign sciences were published in the lands of Islam, Muslims began to study them. A group of Islamic scholars, using their genius, surpassed the original owners of those sciences, adding new ideas and discoveries to them. Thus, the sciences and knowledge branched out, evolving and blending with Islamic culture and traditions, forming the shape of Islamic civilization." He writes: "From what we have said about the role of education in Islamic civilization, it is well understood that knowledge and science flourished in various directions among Muslims. Scholars, jurists, physicians, and philosophers brought forth their genius through this path."

[1]. Doctor of Philosophy in Theology,
Lecturer of the Al-Mustafa International University; Baku, Azerbaijan
E-mail: seyfi14@mail.ru
https://orcid.org/0000-0002-2391-2382
**To cite this article:** Seyfullayev, T. [2024]. Islam's Contribution to Science in Europe (as Described by Western Scholars). *History of Science journal, 5(4)*, pp.59-81.
https://doi.org/10.33864/2790-0037.2024.v5.i4.59-81

**Article history:**
*Received: 25.05.2024*
*Accepted: 28.10.2024*

History of Science
Vol 5, issue 4, serial 18, 2024, pp.59-81

AcademyGate Publishing
p-ISSN 2790-0029; e-ISSN 2790-0037

# İSLAMIN AVROPADA ELMƏ XİDMƏTİ (QƏRBLİLƏRİN DİLİNDƏN)

**Tərlan Seyfullayev**[1]

**UOT:** 297.
**KBT:** 86.38
**HoS:** 40
**DOI:** 10.33864/2790-0037.2024.v5.i4.59-81

**Açar sözlər:**

İslam
Avropa
Elm
Tibb
Gigeniya

## ANNOTASİYA

Qərb tarixçilərinin açıq etirafına görə, Avropanın elmi hərəkatı müsəlmanların elmi hərəkatından ilhamlanmışdır və avropalılar elmi hərəkatlarında İslam alimlərinə borcludurlar! Qərb alimlərinin etiraflarına əsasən "Müsəlmanların, Qərb mədəniyyətinə töhfələrini nəzərdən keçirdikdə, görürük ki, elm şərqdən qərbə nur saçıb!" Dr. Maks Meyerhof deyir: "Müsəlman elmi orta əsrlər Avropasının ən qaranlıq gecələrini işıqlandıran parlayan ay kimi idi. Yeni elmlər ortaya çıxanda ay rəngsizləşdi və qaranlıq gecələrdə bizə bura çatmaq üçün yol göstərən də elə həmin ay idi. Deyə bilərik ki, onun şüaları hələ də bizimlədir!" Eyni kitabda oxuyuruq: "Xülasə, müsəlman alimlərinin kitablarının tərcüməsi ilə Avropanın quru torpağına rəhmət yağışı yağdıraraq onu bərəkətli etdi və yavaş-yavaş avropalılar Şərq elmləri ilə tanış oldular!" O, yazır: "Son illərdə kəşf edilənlər, İslam dünyası elmlərinin qədim tarixinə yeni işıq saldı, etiraf etmək lazımdır ki, bu kəşflər hələ də kifayət deyil; dünya, İslam elmlərinin əhəmiyyətini gələcəkdə daha çox dərk edəcək." Professor Gibb, yazır: "Keçmişə nəzər saldıqda görürük ki, Şərqin elm və ədəbiyyatı Qərb sivilizasiyası üçün xəmir maya kimi idi, elə bir şəkildə ki, Şərq ruhiyyəsinin və düşüncələrinin təsiri Qərbdə keçmiş əsrlərin insanlarının qaranlıq ruhiyyələrini işıqlandırdı və onları daha geniş bir dünyaya apardı!" Corci Zidan məşhur xristian tarixçisi yazır: "İslam sivilizasiyası tam mərhələyə çatdıqda və İslam diyarında xarici elmlər nəşr olunduqda; müsəlmanlar onu öyrənməyə başladılar, bir qrup İslam alimləri öz dühalarından istifadə edərək o elmlərin əsas sahiblərini üstələyiblər və ona yeni fikirlər və kəşflər əlavə etdilər. Beləcə elmlər, biliklər şaxələnib təkamül edərək İslam mədəniyyəti və adət-ənənələri ilə qarışaraq İslam sivilizasiyası şəklini aldılar." O yazır: "İslam sivilizasiyasında təhsilin rolu haqqında dediklərimizdən yaxşı başa düşülür ki, elm və bilik müxtəlif istiqamətlərdə müsəlmanların arasında çiçəkləndi. Alimlər, fəqihlər, həkimlər, filosoflar da bu yolla öz dühalarını üzə çıxardılar."

[1]. İlahiyyat üzrə fəlsəfə doktoru,
Beynəlxalq əl-Mustafa Universitetinin müəllimi; Bakı, Azərbaycan
E-mail: seyfi14@mail.ru
https://orcid.org/0000-0002-2391-2382

**Məqaləyə istinad:** Seyfullayev, T. [2024]. İslamın Avropada Elmə Xidməti (Qərblilərin Dilindən). *History of Science jurnalı, 5(4),* səh.59-81.
https://doi.org/10.33864/2790-0037.2024.v5.i4.59-81

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 25.05.2024*
*Təkrar işlənməyə göndərilmişdir: 23.07.2024*
*Çapa qəbul edilmişdir: 28.10.2024*

# ВКЛАД ИСЛАМА В НАУКУ ЕВРОПЫ (ПО СЛОВАМ ЗАПАДНЫХ УЧЁНЫХ)

**Тарлан Сейфуллаев**[1]

**УДК:** 297.
**ББК:** 86.38
**HoS:** 40
**DOI:** 10.33864/2790-0037.2024.v5.i4.59-81

**Ключевые слова:**

Ислам
Европа
Наука
Медицина
Гигиена

## АННОТАЦИЯ

Согласно явному признанию западных историков, научное движение Европы было вдохновлено научным движением мусульман, и европейцы обязаны своими научными достижениями исламским учёным! По признаниям западных учёных, «Когда мы рассматриваем вклад мусульман в западную культуру, мы видим, что наука осветила Запад с Востока!» Доктор Макс Майерхоф утверждает: «Мусульманская наука была как яркая луна, освещающая самые тёмные ночи средневековой Европы. Когда появились новые науки, луна поблекла, но именно эта луна вела нас сквозь тёмные ночи к тому, где мы находимся сейчас. Можно сказать, что её лучи всё ещё с нами!». В той же книге мы читаем: «Вкратце, с переводом книг мусульманских учёных на засушливую землю Европы пролился дождь милости, сделав её плодородной, и постепенно европейцы познакомились с восточными науками!» Он пишет: «Недавние открытия пролили новый свет на древнюю историю наук исламского мира, но нужно признать, что эти открытия всё ещё недостаточны; мир в будущем всё больше будет осознавать значение исламских наук». Профессор Гибб пишет: «Оглядываясь в прошлое, мы видим, что наука и литература Востока были как закваска для западной цивилизации, таким образом, что влияние восточного духа и мыслей осветило мрачные умы людей в прошлых веках на Западе и привело их к более широкому миру!». Известный христианский историк Джордж Зейдан пишет: «Когда исламская цивилизация достигла своего полного этапа и в землях ислама были опубликованы иностранные науки, мусульмане начали их изучать. Группа исламских учёных, используя свой гений, превзошла первоначальных носителей этих наук, добавив к ним новые идеи и открытия. Таким образом, науки и знания разветвлялись, развиваясь и смешиваясь с исламской культурой и традициями, образуя облик исламской цивилизации». Он пишет: «Из того, что мы сказали о роли образования в исламской цивилизации, хорошо понятно, что знания и наука процветали в различных направлениях среди мусульман. Учёные, юристы, врачи и философы проявили свой гений на этом пути».

[1]. Доктор философии по теологии,
Преподаватель Международного университета Аль-Мустафы; Баку, Азербайджан
E-mail: seyfi14@mail.ru
https://orcid.org/0000-0002-2391-2382

**Цитировать статью:** Сейфуллаев, Т. [2024]. Вклад Ислама в Науку Европы (по Словам Западных Учёных). *Журнал History of Science, 5(4),* с.59-81.
https://doi.org/10.33864/2790-0037.2024.v5.i4.59-81

***История статьи:***
*Статья поступила в редакцию: 25.05.2024*
*Отправлена на доработку: 23.07.2024*
*Принята для печати: 28.10.2024*

 

## *1.Giriş*

Sağlamlığın qeydinə qalmaq İslam dinində fərdi və ictimai hüquqlardan biridir. Uğurlu cəmiyyət o cəmiyyətdir ki, orada insanların bədəni və ruhu sağlamdır. Fiziki və psixi sağlamlıq insan inkişafı üçün ən mühüm vasitədir və iqtisadi baxımdan da mühüm əhəmiyyət kəsb edir. İslam qanunları insan fitrətinə əsaslanır. Halal-haram, əmr və qadağa haqqında gördüklərimiz, insanın mənafeyi nəzərə alınmışdır. Quran ayələri, hədislər və islami mətnlərdə araşdırma və tədqiq İslam dininin fərdin və cəmiyyətin sağlamlığına, diqqət və nəzarətini açıq şəkildə göstərir. İslam dini kimi heç bir din və məktəb sağlamlıq məsələsi və prinsipləri ilə bağlı, əmr verməmişdir. İslam sağlamlıq məsələlərinin çoxunu vacib, haram, müstəhəb və ya məkruh başlıqları altında bəyan etmişdir. Məsələn: qan, irin, sidik, nəcis, ölü heyvanın əti, haram heyvanların əti kimi pis və murdar şeyləri yemək, torpaq, şərab, pivə və insan ağlını aradan aparan, sağlamlığına təhlükə yaradan sərxoşedici maddələri yemək və içmək haramdır. digər tərəfdən, insan sağlamlığında mühüm rol oynayan bir çox sağlamlıq məsələsi vacib və ya müstəhəb kimi, qeyd edilmişdir. Məsələn: namazın şərtlərindən biri bədən və paltarın pak olmasıdır, dəstəmaz və qüsl isə namazın ilk vacib əməlləridir, yəni namaz qılan şəxs əgər öhdəsində qüslü vardırsa qüsl etməlidir və dəstəmazlı deyilsə, namaz üçün dəstəmaz almalıdır, dəstəmazda isə burun və ağzın içini yumaq, dişləri fırçalamaq müstəhəbdir.

İmam Baqir (ə) buyurur: *"İnsanı yaradan Allah onun üçün nəyin faydalı, nəyin zərərli olduğunu bilir və nəticədə faydalı olanı halal, zərəri isə haram etmişdir".* [Kuleyni, 1407 h.q, c.6, s. 242]

Qurani-kərimdə oxuyuruq:

*Onlara pak nemətləri halal, nəcisləri isə (pis şeyləri) haram edir.* [Əraf/157]

İslam təlimlərində sağlamlıq və qidalanma ilə bağlı insan sağlamlığını təmin edən prinsiplərə əməl edilmişdir. İslam məktəbi bu hədəfə çatmağın yolunu pisliyi və çirkinliyi haram, paklığı halal etməklə, insan həyatında mötədilliyi qorumuşdur.

İslam nöqteyi-nəzərindən bəzi hallarda sağlamlıq məsələlərinə riayət etmək vacibdir, çünki İslamda can qurtarmaq vacibdir. Sağlamlıq məsələlərinə əməl edilməməsi insan həyatının təhlükə altına düşməsinə səbəb olarsa, o zaman prinsiplərə və sağlamlıq məsələlərinə riayət etmək lazımdır. Allah-təala buyurur:

*Öz əlinizlə özünüzü təhlükəyə atmayın, yaxşılıq edin! Allah yaxşılıq edənləri sevir.* [Bəqərə/195]

## *2.Gigiyena*

Filip Xuri Hitti "Ərəb tarixi" adlı kitabında yazır:

Məğribdəki İslam hökuməti qüdrət və müsəlman İspaniyanın bu dövrün Avropa və Afrika məsələlərində malik olduğu təsirin zirvəsinə çatdıqmışdı. Bu dövrdə Əməvilərin paytaxtı Kordoba Avropanın ən böyük mədəniyyət mərkəzi idi və Konstantinopol və Bağdadla birlikdə dünyanın üç nüfuzlu mədəniyyət mərkəzi hesab olunurdu. Kordovanın 113.000 evi, 21 şəhərdən kənar məhəlləsi, 70 kitabxanası, çoxlu kitab mağazaları, məscidləri və sarayları var idi və dünyaca məşhur idi ki, bu da turistləri heyran və təəccübləndirirdi.

Şəhərdə hər iki tərəfdən evlərin vasitəsi ilə işıqlandırılan yollar kilometrlərlə daşla döşənmişdi. Ancaq London və Paris, o tarixdən hətta yeddi əsr sonra, bu şəraitə malik deyildi. Əsrlər sonra Parisdə yağışlı bir gündə kimsə çölə çıxmağa cəsarət etsəydi, topuqlarına qədər palçığa batardı.

Lion və Navarra və ya Barselona əmirlərinə cərrah, mühəndis və ya musiqi müəllimi və ya dərzi lazım olanda Kordovanı axtarıb tapdılar. İslam paytaxtının şöhrəti Almaniyaya qədər çatmış və bu barədə Sakson rahibələrindən biri demişdir: "Dünyanın ləl-cəvahiridir." Əməvi hökmdarı və adamlarının yaşadığı şəhər belə idi.

İslam dinin əsaslarından biri də paklıqdır və bütün dünya müsəlmanları bu gün də "dinin əsası paklıqdır" ifadəsini təkrarlayırlar. Məhəmməd peyğəmbərin dövründən əvvəl bütün Ərəbistan torpağında hamam yox idi, hətta Məhəmməd peyğəmbərin dövründə belə idi ki, kişilər hamama qüsl etmək üçün daxil olurdular. Amma bu günlərdə Bağdadda hamam, təkcə bədəni yumaq və təmizləmək üçün deyil, həm də insanların əyləndiyi yerə çevrilmişdir. Qadınlar müəyyən günlərdə hamama təmizlənməyə gedirdilər. İspaniyalı səhhalardan biri 1327-ci ildə Bağdada olub və gördülərini belə deyir: hər məhəllədə iki və ya üç hamam var idi. Onlar çox təmiz və isti və soyuq su ilə təchiz olunurdular. [İsfəhani, 1384 h.ş, c. 1, s.151-153]

Qustav Lebon yazır:

Ərəblər xəstəliklərdə hava və suyun sağlamlıq xüsusiyyətlərindən xəbərdar idilər. Əgər İbn Rüşd bu mövzuda kitablar yazıbsa, İbn Sinanın da bu istiqamətdə kitabları var. Üstəlik, Salerno məktəbinin sağlamlıq təlimatlarında çox gözəl təlimatlar var və hamı bilir ki, bu məktəb ən mühüm ərəb məktəblərindən biridir və onun şöhrəti ərəblərə və müsəlmanlara bağlıdır.

"Səlib yürüşləri" kitabında orta əsrlərdə şəhərlərin sağlamlıq vəziyyəti haqqında aşağıdakılar deyilir:

Xiyabanların çirkliliyi və üfunətli bataqlıqların olması, qəbiristanlığın ortasından keçən su kanalının çirklənməsi şəhər sakinlərinə çətinlik və narahatlıq yaradırdı. Paris şəhəri Avropanın ən gözəl şəhəri sayılsa da, dar və qaranlıq küçələrindən davamlı olaraq insan nəcisinin iyi hiss olunurdu və qoxusu buruna gəlirdi.

Rigord deyir:

Filip Avqustun hakimiyyəti dövründə; bir gün araba şəhərin ortasından keçərkən palçığın içindən keçəndə heç kimin dözə bilməyəcəyi pis bir qoxu gəldi. Sarayının həyətində gəzən padşah bu vəziyyəti görüb küçələrin düzəlməsi fikrinə düşdü. Amma sələfləri bunun baha olmasından həmişə qorxurdular. Padşah, şəhərin sərvətli və firavan yaşayan insanlarını çağırtdırdı. Parisin bütün küçə və xiyabanlarının bərk və möhkəm daşlarla döşənməsi haqqında əmr verdi.

Bu tullantıların mövcudluğu bədbəxtlik yaradır və hər il minlərlə sakinin ölümünə səbəb olurdu. Xəstəlik növləri arasında ən çox yayılanlardan biri taun, digəri isə cüzam idi. Ara-sıra ortaya çıxan və əhalini payız yarpaqları kimi yayan vəba xəstəliyi 1348-ci ildə Qərbi Avropa əhalisinin üçdə birini öldürdü. Cüzam da ümumi bir xəstəlik idi, ona görə də bütün şəhərlər cüzam xəstələri ilə dolu idi. Xəstəliyi müalicə edə bilmədikləri üçün xəstələri yandırırdılar. [İsfəhani, 1384 h.ş, c.1, s.154]

Professor Vekhayt deyir:

Mən özüm xristian olsam da, sağlamlıq prinsiplərinə görə İslam dininə böyük hörmətim var; Çünki bir neçə illik təcrübədən sonra bu nəticəyə çatmışam ki, İslam dininin sağlamlıq prinsiplərinə riayət etməklə bir çox ölümcül xəstəliklərin qarşısını almaq olar.

Xəstəliklərdən biri də cinsiyyət orqanlarının xərçəngidir. Şəxsi təcrübəmdə belə qənaətə gəlmişəm ki, müsəlman qadınlarda cinsiyyət orqanlarının xərçənginin olmamasının əsas səbəbi müsəlman kişilərin sünnət edilməsi və sidiyə getdikdən sonra yuyulmasıdır. Çünki təmizlik xərçəng törədən mikrobların məhvinə səbəb olur və təmizliyə riayət etməklə xərçəngin qarşısını müəyyən qədər almaq olar. Eyni səbəbdən, Avstriyada həmişə tövsiyə edirəm ki, insanlar oğlan uşaqlarını sünnət etsinlər və onlara təmizliyi öyrətsinlər və bu iki şeyi özlərinin gigiyena prinsipləri hesab etsinlər. [Keyhan qəzeti, 1355, №139998]

Dr. Toumanians İslamda sağlamlıq kitabında deyir:

İslamın müqəddəs şəriətində qida, orqanizmin və mədənin sağlamlığını qorumaq üçün təyin edilir; yəni mədəyə və əhval-ruhiyyənin sağlamlığına zərərli olan şeyləri haram, bədən üçün faydası olmayan, yəni yeməkdən nə fayda, nə də zərər əldə edilə bilməyən qidalar isə məkruh adı ilə qadağan edilmişdir. Haramla məkruhun fərqi budur ki, haram

yeməklər mədə və bədən üçün zərərlidir, məkruh isə faydasız və zərərsizdir. (Bu alim mübah ilə məkruhu səhv salıbdır. Düzgününü qeyd edirik: 1) İnsanların orqanizimləri üçün münasib olmayan və tərk edilməsinin daha yaxşı olmasına məkruh deyilir. 2) İnsanların orqanizimləri üçün zərərli olan şeylər haramdır. 3) İnsanların orqanizimləri üçün xeyrli olan şeylər halaldır. 4) İnsanların orqanizimləri üçün faydası və zərəri olmayan şeylər mübahdır. 5) İnsanların yerinə yetirməsi daha yaxşı olanlara müstəhəb deyilir.)

Görünən odur ki, o dövrün ərəbləri (İslamdan əvvəl) gigiyenadan tamamilə xəbərsiz idilər və özlərinə qayğı göstərmirdilər. Əgər haram və məkruh adları işlədilməsəydi, onların zərərli yeməklərdən çəkindirilməsi mümkün olmazdı. İndi bədən üçün faydalı olan yemək və içkiləri təyin etməzdən əvvəl, son dərəcə vacib və sağlamlıq sütunu olan aşağıdakı ümumi qaydanı Qurani-Kərimdən sitat gətiririk.

*Yeyin və için ancaq israf etməyin.* [Əraf/31]

Çox yeməyin zərərləri:

1. Birincisi, çoxlu qida mədəyə daxil olduqda, mədə onu həzm etmək üçün çox hərəkət edib və özündən çoxlu ifrazatlar edir. Aydındır ki, bu halda mədə yorğun və zəif olur və yeməyi tam həzm edə bilmir, əgər yeməyi tam həzm edə bilməsə, həzm olunmamış qida mədədənin turşmasına səbəb olacaq.

2. Qida həzm olunmazsa, bağırsaqlarda yetərincə sorulma olmur və bağırsaqlar lazımi maddələri qəbul edə bilmədiyi zaman bədən zəifləyir və yorğunluq yaranır.

3. Digər tərəfdən, bağırsaqlar həzm olunmamış qidaları xaric etmək üçün çox çalışmalı və ağrıdan əziyyət çəkməlidir.

4. Mədə dolğunluğu yuxusuzluq və diskomfortla yanaşı qida çatışmazlığına və düşüncəsizliyə səbəb olur və nəticədə müxtəlif təhlükəli xəstəliklər əmələ gəlir.

Məhz buna görə də əzəmətli İslam dininin banisi demişdir:

*Mədə hər xəstəliyin evi pərhiz isə bütün dərmanların başıdır.* [Mustəğfəri, 1385 h.q, 25]

Ona görə də insanları hər cür xəstəliklərdən qorumaq üçün faydalı və asan həzm olunan qidalar təyin edilib;

Südə için, çünki o, bir barmağın alın tərini sildiyi kimi, ürəkdəki hərarəti təmizləyir, kürəyi qüvvətləndirir, ağılı artırar, zehni itiləşdirir, görməni yaxşılaşdırır və unutqanlığı aradan qaldırır. [Mustəğfəri, 1385 h.q, 25]

Bu qidalandırıcı mayenin xüsusiyyətlərinə və tərkibinə baxsaq, bu cümlələrin son nəticədə doğru olduğunu görərik; çünki inək südünün tərkibində insan orqanizmi üçün ən yaxşı və ən zəruri qidalar olan 4,5% laktoza, 3,4% yağ və 3,8% albumin var. Bu üç maddənin heç bir zərəri yoxdur, digər tərəfdən də həzmi o qədər asan və ağrısızdır ki, bədəndə zərrə qədər ağrı yaratmır.

Buna görə də süddən istifadə bədənin hissələrini və orqanlarını gücləndirmək üçün ən yaxşı qidadır. Bu yeməyə nəinki yeni tibb əhəmiyyət verib, hətta qədim tibb də onu ən güclü qida hesab edib, çünki qeyd edildiyi kimi, südün tərkibində qida maddələri var və çox asan həzm olunur, xüsusən də xəstələr üçün ən yaxşı qidadır. Çünki südün zərərli olduğu heç bir xəstəlik yoxdur.

Məhz bu səbəbdən müqəddəs qanun yazan (Peyğəmbər), təkcə kişilərə deyil, həm də qadınlara belə göstərişlər verirdi:

*Hamilə qadınlarınıza süd verin, çünki bu, uşağın ağlını artırır.* [Məclisi, 1404 h.q, c.59, s.294]

Uşağın ağlını artırır cümləsi, məhz bu mənada işlənir, hamilə qadın süd içdiyinə görə güclənir, bədənində qan daha çoxalır və orqanları sağlam olur. Həm də süd ürəyi qüvvətləndirir və həzm prosesini sürətləndirir, eyni zamanda dölə çoxlu sağlam qan tədarük edib, onu sağlam edir. Məlumır ki, sağlam ağıl, sağlam bədəndə olur. [İsfəhani, 1384 h.ş, c.1, s.156]

Dr. Zigrid Hunke Zəkəriyya Razinin şərhi halında belə yazır:

Razi havanın istiliyinə, küləyinə və rütubətinə, yaşayış yerinin təmizliyinə, evlərdə hamamların olmasına diqqət yetirir. O, sağlam havanı tövsiyə edir. Həşəratdan qorunmaq üçün ətirli toxumları yandırıb tüstülətməyi məsləhət bilir. O, xəstənin otağının temperaturuna, həmçinin sağlam içməli suya və vaxıvaxında yuyunasına diqqət yetirməyin zəruriliyini qeyd edir; yəni kilsə ağalarının nəzərində günah sayılan və bu səbəbdən də orta əsrlərdə Avropalı xristianlar səlib yürüşlərindən əvvəl bu sağlamlıq göstərişlərini, eləcə də fiziki məşqləri və istirahəti əxlaqsızlıq və iffətə zidd hesab edirdilər və onları günah sayırdılar. Bunu edənlər isə alçaldılır və qınanırdılar. Razi öz adamları vasitəsilə xəstələri üçün qeyd olunan şəraitə uyğun yer axtarırdı. [İsfəhani, 1384 h.ş, c.1, s.160].

### *3.Tibb elmi*

Professor Risler bu barədə belə yazır:

"Müsəlmanlar tibbdə ən yüksək mövqe və məqamı əldə edib, 500 il dünya tibbinin zirvəsində dayandılar. Bu sahədə peyğəmbərə istinad edilən 300 hədis var. Bu hədislərin çoxu yeməkdə etidal və imsaq etmək, sağlıq, sanitar-gigiyenik üsullara riayət etməyə aiddir. Məsələn, "Taunun olduğu yerə girməyin, orda olsanız, oradan çıxmayın" tapşırığı bugünkü karantin anlayışının əsasını təşkil etməkdədir. Rislerin dediyinə görə, müsəlmanlar Hippokrat və Calinusun tibbini tərcümə edib öyrəndikdən sonra kifayətlənməyib, şəxsi müşahidə və klinik təcrübələrini diaqnoz və müalicə üçün əsas qərar verdilər. O zamandan bəri tibb təcrübi elm mahiyyətini qazandı və böyük İslam həkimi Ali İbn Abbasın yazdığına görə onun tədqiq və araşdırmaları xəstəxanalardan toplanıb, o zamandan bəri İslam mədrəsələrində tibb, mühəndislik fakültələri və laboratoriya qurulub.

Vil Durantın yazdığına görə, ilk islami xəstəxana miladi tarixi idə 704-cü ildə "bimaristan" adı ilə Şamda qurulub və 978-ci ildə bu xəstəxananın 24 həkimi olmuşdur. Tibb dərsləri, xəstəxanada verilirdi. İmtahan vermədən və diplom almadan həkimlik etmək qadağan idi. Harun ər-Rəşidin zamanında Bağdadda ilk xəstəxana quruldu, 10-cu əsrdə orada daha 5 xəstəxana yaradıldı. Belə nəzərə gəlir ki, bu xəstəxanaların bərpa edilməyində Cündişapurdakı universitet xəstəxanasından faydalanıblar.

Professor Jorj Rivar "İslamın siması" adlı kitabında deyir:

Müsəlman həkimləri ən çox cərrahlıqda məharət qazandılar. İslam cərrahları 11-ci əsrdə katarakt, məsanə daşı, kotrizasyon (dağlamaq) əməliyyatlarını bilir, uyutmaq (anesteziya) və uyuşdurmaq (lokal anesteziya) üçün "İvraie təlxə", buğda və xaşxaş işlədirdilər. Qurtubəli Abbas oğlu Əbülqasım xələf, bir çox cərrahi alətlər düzəltmiş və cərrahlıqla işlətmişdir. Farmokoloji və tibbdə işlənən maddələrin elmi tədqiqi də, İslamda başlanıb. V. Duranta görə, İbn Sina ən böyük müəllim, Razi ən böyük həkim, Cabir (İmam Cəfər Sadiqin (ə) şagirdi) əski zamanın ən böyük kimyaçısı sayılır. İbn Sina və Razinin əsərləri bugünkü tibbin əsasını təşkil edib, əsrlər boyu qərb tibb məktəblərində oxunub.

Gotiyerin "Müsəlmanların əxlaq və ədabı" adlı kitabında yazılıb ki, orta əsrlər və renessans dövründə Avropa Boqrat və Calinusdan çox İslam həkimlərini təqib edib. Razi (850-932) əlli il Bağdadda həkimlik edib, onun əsərləri 16-18-ci əsrlərdə dəfələrlə latın dilinə tərcümə edilib.

İbn Sina tibb sultanı hesab olunur və dəyəri Razidən də artıqdır. Onun "Qanun" adlı tibb kitabı Avropanın bir çox dillərinə tərcümə edilib. Bu iki həkimin kitabları 17-ci əsrə qədər tibb tədrisinin əsasını təşkil edib. "Qanun" kitabı, əsrlər boyu Avropanın dərslik kitabı və həkimliyin müqəddəs kitabı olub. Razinin çiçək və qızılca haqqında kitabları xəstələrin klinik müşahidəsi və təhlili ilə yazılıb. Bu kitablar yoluxucu xəstəliklər haqqında yazılan ilk elmi əsərlərdir. Bu iki əsərin ingiliscə tərcümələri 15-19-cu əsrlərdə 40 dəfə nəşr edilib.

Tibb elmi və həkimlik İslam məktəblərindən İtaliyada Salerin və Fransada Montpelier tibb məktəblərinə keçdi. Salerin məktəbi 9-cu əsrdə Şarl Mayn tərəfindən quruldu və 3 əsr Avropanın tibb mərkəzi oldu. [Heyət, 2010, s.7]

**Qustav Lebon**

O, yazır: ərəb təbabətinin müəlliflərinin sayı çox böyükdür. İbn Əbi Əsibəə [Zərkeli, 2002, c.1. s.188] əsərlərinin bir cildini həkimlərin adına ixtisas vermişdir. Biz onların arasından, məşhur olanları burada qeyd edirik.

Ən məşhur ərəb həkimi Razidir ki, kimyaçılar arasında onun da adını çəkdik... və onun bütün tibbi məsələləri özündə cəmləşdirən məşhur "əl-Havi" kitabının adını qeyd etdik. Digər bir kitab isə onun Mənsura göndərdiyi "Mənsuri"-dir və on hissədən ibarətdir.

Razi son dərəcə təvazökar bir həkim idi. Deyirlər: O, Kordova xiyabanlarından birində huşunu itirmiş və yerdə uzanmış bir adamın yanından keçirdi, insanlar onun öldüyünü düşünürdülər, onu ayaqlarına çubuqla vurmaqla (xüsusən də ayağının üstünə vuraraqla) diriltdi. Bu xəbər xəlifənin qulağına çatdıqda, onu ölü bir insanı diriLdən şəxs kimi tərifLədi. Razi bu xəbəri eşitdikdə dedi: mən heç nə etməmişəm, çünki mən səhra ərəbindən bu müalicə metodunu (belə bir xəstəni bu cür müalicə etdiyini görmüşəm) öyrəndiyim, etdiyim yeganə iş, onun xəstəliyini düzgün təyin etdim.

Uzun müddət, Avropa universitetlərində alimlər Razinin kitablarını tədris edirlər, Leuven Universitetində isə İbn Sinanın kitabları XVII əsrdə tədrisin əsasını təşkil edir.

Əli bin Abbas başqa bir məşhur ərəb həkimdir. O, Razi ilə demək olar ki, müasir idi və eramızın 10-cu əsrinin sonlarında yaşamışdır. Onun kitablarından biri də nəzəri və praktiki təbabəti əhatə edən "Məlki" kitabıdır.

Bütün ərəb həkimlərinin ən məşhuru İbn Sinadır və onun tibb aləminə elə təsiri olub ki, ona "tibbin şahı" ləqəbi verilib. İbn Sinanın ömrü çox olmasa da, onun kitabları çox qiymətlidir və çox dillərə tərcümə olunmuşdır. Onun kitabları altı əsr ərzində tibbdə istinad olub. Fransa və İtaliyanın bütün tibb universitetlərində yeganə dərslik, İbn Sinanın kitabları idi və 18-ci əsrə qədər bir neçə dəfə nəşr olunmuşdır.

Ən məşhur ərəb cərrahı 1107-ci ildə vəfat edən Əbu əl-Qasim Qurtubidir və o, bir çox cərrahi alətlər icad etmiş və kitabında onların şəklini çəkmişdir. Böyrək daşlarının əridilməsinin keyfiyyətini məhz o təsvir etmişdir və yanlış olaraq yeni ixtiralardan biri hesab olunur. Əbül-Qasim 15-ci əsrə qədər Avropada məşhur olmayıb və onun şöhrəti məhz bu əsrdə orada yayılıb. Məşhur fizioloq Haller onun haqqında belə deyir: 14-cü əsrdən sonra ortaya çıxan bütün cərrahlar Əbül-Qasimin kitablarından istifadə edirdilər. Əbu əl-Qasimin kitabının latın dilinə tərcüməsinin ilk nəşri miladi 1497-ci ildə, sonuncu nəşri isə 1861-ci ildə olmuşdur.

On ikinci əsrdə yaşamış İbn Zöhr Eşbili tibbdə böyük nüfuza malikdir, baxmayaraq ki, o, digər bir neçə nəfərin şöhrət səviyyəsinə çatmasa da, islahatlar aparmış təcrübəli həkim idi.

1126-cı ildə Kordovada doğulan və 1188-ci ildə vəfat edən İbn Rüşd təbabətlə bağlı kitablar yazmışdır, baxmayaraq ki, onun fəlsəfə və Aristotelin kitablarının şərhindəki şöhrəti tibb sahəsindəki şöhrətindən daha çoxdır. O, İbn Sinanın kitablarına şərhlər yazmış, eləcə də tibb, qızdırmanın fəsadları və s. kitablar yazmışdır, onun təbabətə aid kitabları Avropada dəfələrlə nəşr edilmişdir.

Ərəblər bitkilərin xüsusiyyətlərini qeyd etməklə tibb elmi ərəblərə borcludur. Həmçinin işlətdiyimiz məcunların çoxunu onlar hazırlamışlar. Bir cümlə ilə desək, tibb elmi müsəlmanlara borcludurlar. Bəziləri anesteziyadan istifadənin yeni təşəbbüs olduğunu düşünür, amma belə deyil, ərəblər (Ərəblər dedikdə məqsədi müsəlmanlardır) bu dərmandan qabaqcadan xəbərdar idilər.

**Dr. Maks Meyerhof**

Səlib yürüşlərində müsəlmanlar Avropa həkimlərinə gülürdülər. Çünki onların məlumatlarını çox aşağı və ibtidai hesab etdilər. Xristianlar, İbn Sina, Cabir, Həsən İbn

Heysəm və Razinin kitablarını Latın dilinə çevirdilər, tərcüməçiləri bilinməsə də, tərcümələri indi mövcuddur. XVI əsrdə İbn Rüşd və İbn Sinanın kitabları İtaliyada tərcümə edilmiş və bu kitablar İtalya və Fransa universitetlərində tədris edilmişdir. Bir sözlə, Şərq elmləri Avropanın quru torpağına mərhəmət yağışı kimi yağdı və onu məhsuldar etdi və avropalılar Şərq elmləri ilə yavaş-yavaş tanış oldular. [Walker & et., 1325 h.ş, 132]

**Filip Xuri Hitti**

Razi və İbn Sinanın şəkilləri Paris Universitetindəki tibb fakültəsinin böyük zalını bəzəmişdir. Qeyd etmək lazımdır ki, avropalıların elm və sənaye sahəsində, xüsusən də tibb elmində müsəlmanlara öyrədə biləcəkləri elmi məlumatları yox idi. [Hitti, 1344 h.ş, 193]

Necə ki, o günlərdə ərəb tarixçilərindən biri avropalıların tibbi məsələlərdə cahilliyi haqqında istehzalı əfsanələr nəql edirdi. [İsfəhani, 1384 h.ş, c.1, s.170]

**Con Davenport**

Avropa İslam dininə çox borcludur. Avropa Məhəmmədin davamçılarının başqa bir dinə sahib olduğunu xatırlamalıdır, köhnə ilə yeni ədəbiyyat arasında əlaqə quran məhz müsəlmanlar idi. Avropanın qaranlıqda qaldığı uzun müddət ərzində müsəlmanlar bir çox yunan filosofunun yazılarını və araşdırmalarını davam etdirdilər və ən vacib təbiət elmləri, riyaziyyat, tibb və s. sahələrinin inkişafını öhdələrinə götürmüşdülər, bu elmlər onların zəhmətlərinə çox borcludurlar. [Davenport, 1348 h.ş, 131]

**Corci Zeydan**

İslam təbabəti İslamın gəlişinə qədər sivil xalqlar arasında yayılmış təbabətin xülasəsi idi; çünki müsəlmanlar Hippokratın, Qalenin və digər yunan həkimlərinin tibb kitablarını tərcümə etmiş və qədim Keldani təbabəti ilə Yunan təbabətinin qarışığı olan Suriya təbabəti ilə əhatə olunmuşdular. Cündişapurun iranlı təbibləri, yunan dilindən götürdükləri məlumatları ərəbcəyə çevirdilər. Hindistanlı həkimləri işə götürərək, Hindistan tibbi məlumatlarından xəbərdar oldular. Bundan əlavə, onlar özləri də cahiliyyət dövründən tibblə bağlı bəzi şeyləri bilirdilər və bu məlumatların qarışmasından İslam təbabəti meydana çıxdı ki, bunun ən yaxşı nümunəsi Əbu Bəkrin Razi yazdığı "Əl-Mülki" və ya "Əl-Məluki" kitabıdır. Sözügedən kitab İslam sivilizasiyasının təkamülü dövründə (IV əsrin ortalarında) yazılmışdır. Razinin bu kitabdan başqa tibb və fəlsəfəyə aid başqa əsərləri də var. İbn Sinanın "Qanun" kitabı yaranana qədər "Məluki" kitabı tibb alimləri üçün yeganə sənəd və istinad sayılırdı.

İbn Sinanın indi mövcud olan "Qanun" kitabı hərtərəfli tibb və əczaçılıq toplumu kitabı hesab olunur. Bu kitabın üstünlüklərindən biri odur ki, Yunanıstan, Keldan, Hindistan və İranda xəstəliklərin diaqnostikası, əlavə olaraq onların müalicəsi və bitkilərin xüsusiyyətləri qeyd edilmişdir.

Avropanın dirçəlişində elm adamlarının istifadə etdiyi digər İslam təbabəti kitabı hicri beşinci əsrdə yaşamış Əndəlüsli həkim Əbu əl-Qasim Xələf bin Abbas Zəhravinin yazdığı "ət-Təsrif liman əcəzə ənit-təlif" kitabıdır. Bu kitabın digər kitablara başqa üstünlükləri ilə yanaşı, cərrahiyyə hissəsi də qeyd olunmasıdır.

Digər bir kitab isə hicri VI əsrin ortalarında filosof İbn Rüşd üçün yazılmış Əndəluslu Əbdül Mulak İbn Zəhr tərəfindən yazılmış "Ət-Taysir" kitabıdır.

Çoxlu İslam həkimləri və onların əsərləri var. Onların hamısının adını çəkmək vaxt aparacaq.

Amma qısaca olaraq deyirik ki, müsəlmanlar arasında üç-dörd əsr ərzində yüzlərlə həkim olub, onlar tibb və digər elmlərə dair kitablar yazıblar, onların tərcümeyi-halı və əsərləri aşağıdakı kitablarda təsvir olunub:

1. Əl-Hükəma, İbn əl-Qətfi tərəfindən yazılmışdır;
2. Təbəqatul-ətibba, İbn əbi Əsibəə tərəfindən yazılmışdır;
3. Kəşfuz-zunun, Haci Xəlifə tərəfindən yazılmışdır.

Təbii ki, daxili hadisələrə və sənədlərin itməsinə görə onların dəqiq adlarını müəyyən etmək bizim üçün mümkün deyil, amma əldə olan dəlillərdən aydın olur ki, onlar olub.

Məsələn, hicri 4-cü əsrin əvvəllərində Əl-Muqtədir Billahin dövründə (sarayda olan məşhur həkimlər və digər İslam ölkələrində yaşayan həkimləri çıxılmaqla) Bağdadda 860 həkim tibb vəsiqəsi almaq üçün imtahan vermişdi, bu qədər həkimin imtahanda iştirak etməsi bunu göstərir ki, o dövrdə Bağdadda ən azı 1000 həkimin yaşamışdır.

Qədim həkimlərin hər biri öz sahəsində mütəxəssis olurdular, lakin digər sahələrdə də əhəmiyyətli biliklərə malik idilər. [İsfəhani, 1384 h.ş, c.1, s.171]

Corci Zeydan ardıyca yazır:

Müsəlmanlar arasında qadın həkimlər az deyildi, onların arasından çoxlu görkəmli həkimlər var idi məsələn: tibb və xüsusi ilə də qadın xəstəlikləri sahəsində mütəxəssis olan, o dövrdə xilafətin hərəmxana və qadınlarının həkimi olan Uxtu əl-Həfid Əndəlusi və onun qızıdır.

Zeynəb Əməvilər dövrünün məşhur qadınlarından biridir, Şamda təbabətlə məşğul olub, xüsusilə göz cərrahiyyəsində mahir olub.

Müsəlman həkimlərin istifadə etdiyi analiz üsulu bütün dünyada qalıb və bu gün onlar eyni analizlər əsasında xəstəliyin diaqnozunu qoyurlar. Müsəlman həkimlər qanaxmanın qarşısını almaq üşün soyuq sudan istifadə ediblər. İlk dəfə olaraq xəstənin dırnağından vərəm diaqnozunu anladılar və sarılıq və sarılığın müalicəsini təsvir etdilər.

İslam həkimləri, nəbzin hərəkətindən, xəstənin ürəyinin vəziyyətini, sidiyi görməklə isə qaraciyərin vəziyyətini müəyyən edirdilər. Təəccüblüdür ki, o testlər hələ də sivil dünyada mövcuddur və nəbz və sidiklə xəstəliklərə diaqnoz qoyur.

Yuhənna ibn Masəviyyə cüzam haqqında kitab yazan ilk şəxsdir. Əbu Bəkr Razi çiçək və tif xəstəliyi haqqında xüsusi kitab yazan ilk həkimdir. Bunlara əlavə olaraq, müsəlman həkimlər tibb elminə dair əhatəli toplular yazmışlar.

**Maks Meyerhof**

İslamın zühurundan sonrakı ilk əsrlərdə təbiət elmləri arasında ən çox tibb elmi tərəqqi tapmışdır. Əməvi xilafəti dövründə alimlər, xüsusən də həkimlər Dəməşqə (o zaman paytaxt idi) gedirdilər. Şübhəsiz ki, Razi İslam dünyasının ən böyük həkimi və ən mühüm fizik alimi idi. Razinin ən məşhur kitabları çiçək və qızılca haqqındadır. Bu kitab əvvəlcə latın dilinə, sonra isə digər Avropa dillərinə tərcümə edilmiş və 1498-ci ildən 1866-cı ilə qədər müxtəlif dillərdə qırx dəfə çap edilmişdir. Cənab Razinin dünyanın ən yaxşı tibb kitablarına bərabər olan ən böyük tibb kitablarından biri "Əl-Havi" adlanır və o, yunan və ərəb təbabətini ehtiva edən əhatəli bir kitabdır. Bu adam, bütün ömrünü kitab oxumaqla, tibbi təcrübələrlə keçirmiş və həyatının son illərində əldə etdiyi məlumatları kitab halına gətirmişdir. Razi tibb kitablarından başqa ilahiyyat, fəlsəfə, riyaziyyat, astronomiya və təbiət elmlərinə aid kitablar qoyub getmişdir. Onun son kitabı səma, zaman, maddə, hərəkət, qidalanma, böyümə, atmosferi bilmək, işıq və kimyagərlik haqqındadır. Razinin kimyagərliyinin əhəmiyyəti, son bir neçə ildə məlum olub.

Cənab Razinin müasir dövrünün məşhur yazıçılarından biri Fatimi xəlifələrindən birinin həkimi olmuş İshaqdır. Onun yazıları 1080-ci ildə Afrikalı Konstantin tərəfindən latın dilinə tərcümə edilmiş və orta əsrlərdə Avropa təbabətinə böyük təsir göstərmişdir. O dövrdə məşhur müsəlman həkimlərdən biri Abbas idi; bu adam tam və çox yaxşı bir tibb ensiklopediyası yazıb, kitabın əvvəlində ərəb və yunan tibb traktatları haqqında son dərəcə maraqlı bir fəsil yazıb və sonra tibbin bütün elmi və fərziyyə hissələrini izah edib. Bu kitab iki dəfə tərcümə olundu, lakin sonralar İbn Sinanın Tibb kitabı bunu əvəz etdi.

Böyük alim Əbu Əli Hüseyn İbn Sina İslam dünyasının ən böyük alimlərindən biri idi, baxmayaraq ki, o, daha çox filosof və fizik kimi tanınsa da, Avropada tibbə təsiri heyrətamizdir. Ən yaxşı tibb kitablarından biri olan İbn Sinanın "Qanun" kitabı, Avropada tərcümə edilmiş və alimlərin ixtiyarında qoyulmuşdı, bundan əlavə, XV-ci əsrin son 30 ilində bu kitab Avropada 16 dəfə nəşr olunub, onlardan 15-i latın dilinə, biri isə ibri dilinə

tərcümə edilib. 16-cı əsrdə iyirmi dəfədən çox çap olunub və bu onun kitabının əhəmiyyətini göstərir. İbn Sinanın 15-ə yaxın məşhur tibb kitabı var. Bundan əlavə, o, ilahiyyat, hikmət, astronomiya və dilçiliklə bağlı 100-ə yaxın kitab yazmışdır.

Əbu əl-Qasim adlı bir müsəlman həkim Kordovada saray həkimi idi. Onun bəzi risalələri cərrahiyyə ilə bağlı idi ki, İslam yazıçıları o dövrə qədər bu haqda heç nə yazmamışdılar və onun risalələri Avropada mövcud cərrahiyyənin əsası hesab edilməlidir. Bu risalələri erkən vaxtlarda latın və ibri dillərinə tərcümə edildi və məşhur fransız cərrahı Qodoşiliak (1300-1368), o kitabın latın tərcüməsini öz kitabına əlavə etdi.

11-ci əsrdə Misir, Suriya və İraqda təcrübələr və tibbi kitabların yazıları çoxaldı. Qahirədən olan Əli bin Rizvan misirlilər üçün tibbi kitab yazıb. Bu alim Galen və yunan alimlərinin sadiq pərəstişkarı idi. Müasirlərindən olan İbn Bətlan Bağdadda başqa bir tibb kitabı yazdı və hər ikisi tez bir zamanda latın dilinə tərcümə edildi.

Əbu Reyhan əl-Biruni, həkim, astronom, riyaziyyatçı, fizik, tarixçi və coğrafiyaçı idi. O, İslam elmlərinin qızıl dövrünün ən görkəmli alimlərindən hesab olunur.

İbn Rüşd, Aristotel filosoflarından olan İbn Zöhrün tələbəsi və dostu idi. Bu adam müxtəlif dərmanlar haqqında 16 kitab yazmışdır ki, onlardan birinin latın dilində tərcüməsi çox məşhurdur. Həmin kitab "Külliyat fi Tibb"-dır. 1255-ci ildə yəhudi Paduan Bonacusa tərəfindən "Colliget" adı ilə tərcümə ediləşdir.

Məşhur ərəb tarixçisi, siyasətçisi və həkimi İbn əl-Xətib İslam alimləri tərəfindən kəşf edilən vəba xəstəliyini yaxşı şəkildə izah etmişdir.

Digər bir həkim İbn əl-Xatmədir. 1369-cu ildə vəba xəstəliyi haqqında bir kitab yazmışdır və o kitab Avropa alimləri tərəfindən istifadə edilmişdir.

Xəstəliyin yayılmasının diaqnozunu qoyan belə müsəlman həkimlərə son dərəcə minnətdar olmalıyıq; çünki orta əsrlərdə əksər yunan həkimləri bu məsələyə aydınlıq gətirməyiblər.

Bir sözlə, bu vasitə ilə Şərq elmləri Avropanın quru torpağına rəhmət yağışı kimi yağmış və onu məhsuldar etmişdir. Avropalılar yavaş-yavaş Şərq elmləri ilə tanış oldular, cərrahiyyə, qadın xəstəlikləri, göz xəstəlikləri haqqında kitablar yazdılar. 1780-ci ilə qədər Almaniya və İngiltərədə Razi və Əli İbn İsanın bəzi tibbi göstərişləri qəbul edilmişdi və hələ də bəzi İslam xalqlarında İbn Sina və Razinin metodu ilə cərrahityyə əməliyyatı olunur. [İsfəhani, 1384 h.ş, c.1, s.174].

**Dr. Siqrid Honke**

Honke orta əsrlərdə Frank təbabəti haqqında yazır:

On gündən sonra Sabit yenə əmimin yanına gəldi. Biz elə bilirdik ki, o, Livanda yaralı və xəstə frankları müalicə edir. Səlibçilər öz həkimlərinin müalicəsinə, dərmanına az inanırdılar və çalışırdılar dəri xəstəliklərini, mədə xəstəliklərini, ürək ağrılarını və digər xəstəlikləri müsəlman həkimlər müalicə etsinlər. Əl-Munitra qəsrində yaşayan əmim Hakim Şizerin xahişi və təkidi ilə bacarıqlı və müsəlman həkim olan Sabit Franki Man dostlarının müalicəsi üçün onlara verildi. Şizerin hakimi əmim, əl-Munitra qəsrində yaşayan frank qonşularımızın xahişi və təkidi ilə mahir və müsəlman həkim olan Sabiti, frank dostlarımızı müalicə etmək üçün onlara verdi. Lakin Sabit tezliklə Frank qarnizonundan qayıtdı. Təəccüblə ondan soruşduq: xəstələri necə tez müalicə etdiniz? Sabit cavab verdi:

Budundan çiban çıxmış bir zadəganı və yüksək hərarəti olan bir qadını gətirmişdilər, kişinin çibanına irin çıxaran məlhəm sürtdüm, çiban açıldı və yaxşılaşırdı, qadına da yemək yazdım, o da yaxşılaşırdı, bir frank həkimi gəlib dedi: bu adam (yəni Sabit həkim) sizi sağalda bilməz; sonra üzünü ayağında çiban olana çevirib soruşdu: bir ayaqla yaşamaq istəyirsən, yoxsa iki ayaqla ölmək? O, cavab verdi, bir ayağımla sağ qalmaq istərdim. Sonra franklı həkim göstəriş verdi güclü bir kişi balta ilə gətirsinlər, mən orada olduğum zaman çiynində balta olan bir kişi gəldi. Bu zaman həkim, xəstənin ayağını kötüyün üstünə qoydu və baltalı adama bir zərbə ilə xəstənin ayağını kəsməyi göstəriş verdi. O,

balta ilə xəstənin ayağına zərbə endirib. Amma həmin zərbə ilə ayağı kəsilmədi və ikinci zərbəni endirdi. Bu iki dəhşətli zərbə ilə sümük iliyi çıxdı və xəstə elə orada öldü. Sonra Frank həkimi o qadını müayinə edib dedi: bu qadının başında şeytan var və ona aşiq olub, onun saçını kəsin! Həmin qadın verdiyim reseptə əsasən yaxı olmuşdı, ancaq sonradan yeməklə bağlı verdiyim reseptə fikir vermədi, çəkinmədən yenə həmyerlilərinin yediyi yeməkləri yedi, sarımsaq və xardal yeməklə yenidən qızdırması gücləndi. Frankinin həkimi dedi: Şeytan onun beyninə girib, bu cümlə ilə salmani bıçağı götürüb baş dərisini xaç şəklində kəsdi, kəllə sümüyü üzə çıxana qədər dərini ortadan çəkdi. Sonra kəllə sümüyünə duz ilə sürtdü, qadın elə o vəziyyətdə dünyasını dəyişdi.

Bu hadisədən sonra mən onlardan soruşdum mənə ehtiyac varmı?

Onlar cavab verdilər, xeyr, sənə ehtiyac yoxdur. Mən də o vaxta qədər xəbərsiz olduğum Frankların həkimlik sənətini gördükdən sonra Frank kazarmalarından qayıtdım.

Frank tibb sənətinin nümunəsi kimi bu qorxulu əhvalatı bizə istehzalı təbəssümlə danışan bu şəxs, Əmir Usamə bin Munqad (1188-1095) Şizerin qız nəvəsidir. [Hunke, 1362 h.ş, c.2, s.43]

### *4.Müsəlman həkimlərə tibbi sertifikatın verilməsi*

İlahiyyat məktəblərinin professorları tibb fakültəsi tələbəsinin nə qədər müddətdə və hansı kurslarda və təcrübəsinin hansı həddə olduğu haqda sertifikat verdilər. Hər cür təsadüfi və savadısz şəkildə müalicə etməyin qarşısını almaq üçün və xəstəni həkim kimi rəsmi müalicə etmək istəyən şəxs rəsmi lisenziya təqdim etməli idi. Bu, həm Şərq İslam Dövlətində, həm də İslam İspaniyasında xəlifə tərəfindən qoyulmuş bir qanun idi. Amma bu sərəncam ilk dəfə 931-ci ildə Bağdadda verilmişdir. Xəlifə Əl-Məqtədir Bağdaddakı həkimlərdən birinin xəstənin ölümünə səbəb olan səhvə yol verdiyini öyrənir. Ona görə də əmr edir ki, bundan sonra hökumətin xidmətində olanlardan başqa bütün həkimlər imtahan versinlər və həkimliklə məşğul olmaq üçün yazılı icazə alsınlar. O, həkimlər birliyi yaratdı və Sənan bin Sabiti onun rəhbəri təyin etdi. Həkimlərə öz ixtisaslarına uyğun sertifikatlar verməyi əmr etdi ki, onların hər birinə ancaq kifayət qədər biliyi və bacarığı olan xəstəliklər üzrə həkimlik etməyə icazə verilsin.

931-ci ildə hökumətin xidmətində olan rəsmi həkimləri saymasaq, təkcə Bağdad şəhərində 860 həkim var idi. Eyni zamanda, bütün Ren-Vestfalyada (Almaniya) bir dənə də olsun həkim tapmaq mümkün deyildi. [Hunke, 1362 h.ş, c.2, s.72]

### *5.Xəstəxana tikintisi*

Dr. Zigrid Hunke yazır:

Bir neçə xəstənin bir yerdə baxıldığı evlər Avropada 12-ci əsrin əvvəllərinə qədər mövcud deyildi, səlib yürüşləri başladıqdan sonra müsəlmanlardan nümunə götürülərək Avropada xəstəxana quruldu. Yəni Avropada evlər düzəldildi təkcə xəstələr orada qalırdı müalicə olunmurdular. Xəstələr uzun müddət həkimsiz və müalicəsiz qalsalar da, heç olmasa onlara qayğı göstərilib. Xəstəni müalicə etmək deyil ağrıları azaltmaq, kilsənin düşüncə və inanclarının sərhədləri daxilində idi. Avropadakı ilk xəstəxanalardan biri Parisdə (1536-cı ildə qurulmuş) Hotel Dave (Tanrı sığınacağı) idi, o dövrdə oranı görən şəxslərin dediklərinə əsasən Avropanın ən yaxşı xəstəxanası idi.

### *6.Qərbdə xəstəxanaların şəraiti*

Kərpicdən döşənən yerin üzərinə quru otlar yayılmışdı və bu otların üzərində xəstələr uzanırdılar, xəstələrin uzanması belə idi ki, birinin başı digərinin ayaq tərəfində olurdu (baş-ayaq şəkildə uzanırdılar). Uşaqlar yaşlıların yanında yatırdılar. İnanılmaz bir iş olsa da, kişi xəstələrlə qadın xəstələr bir yerdə yatırdılar. Yoluxucu xəstəlikləri olan insanlar qismən sağalmış xəstələrin yanında olurdu və hamısı bir-birinə yaxın yatırdılar.

Çox vaxt xəstələrin ən əsas ehtiyacları belə ixtiyarlarında olmurdu. Xəstələrə ən pis yeməkləri verirdilər, o da kifayət qədər və vaxtında olmurdu. Yemək yalnız xəstələri

görməyə gələn xeyirxah insanların özləri ilə yemək gətirdikləri zaman kifayət qədər verilirdi. Bu məqsədlə xəstəxananın qapısı gecə-gündüz açıq olurdu, istənilən şəxs gələ və xəstələr üçün istədiyi yeməyi özü ilə gətirə bilərdi.

Bütün bina milçəklər və iyrənc böcəklərlə dolu olurdu. Səhər vaxtı xəstələrin yatdığı otaqların içərisindəki hava o qədər pis qoxulu orurdu ki, gözətçilər və tibb bacıları burunlarının önünə sirkə batırılmış süngər tutaraq içəri girmək məcburiyyətində olurdular.

Ölənlərin cəsədləri öldükləri yerdə 24 saata qədər qalırdı bəzi hallarda daha çox müddət qalmalı olurdular və daha sonra uyğun bir yerə köçürülürdülər. Digər xəstələr bütün bu vaxtı cansız meyitlərlə keçirməli olurdular. Əlverişsiz şəraitdə cəsədlər qısa müddətdən sonra iyilənir və ətyeyən yaşıl milçəklər ətraflarına toplanırdı. [Hunke, 1362 h.ş, c.2, s.43].

Orta əsrlərdə Avropa xəstələrinin və xəstəxanalarının vəziyyətindən qısaca xəbərdar olduqdan sonra müsəlman xəstələri və xəstəxanalarının vəziyyəti ilə də tanış olaq və bir az özümüzə gələk, nə olduğumuz və başımıza gələnlər barədə məlumatımız olsun.

### *7.Orta əsrlərdə müsəlman xəstələri və xəstəxanalarının vəziyyəti*

Bir xəstənin, xəstəxanadan atasına yazdığı məktub;

Əziz atam, məni görməyə gələndə mənə pul gətirməyini soruşursan?! Xəstəxanadan nə vaxt çıxsam, yeni bir paltar dəsti və beş qızıl sikkə alacağam, xəstəxana bunu xəstəxanadan gəldikdən dərhal sonra işə getməməyimə görə kömək edir, buna görə də heyvanlarını satmağın lazım deyil. Ancaq məni görmək istəyirsənsə, bu günlərdə gəlməyin məsləhətdir. Mən cərrahiyyə otağının yanında ortopediya şöbəsinə yerləşdirilmişəm, əsas qapıdan girdikdən sonra cənub hissədə yerləşən bayır zaldan keçirsən, orada poliklinikanın keçidi yerləşir. Məni yıxılandan sonra bura gətirdilər. Orada hər bir xəstəlik əvvəlcə köməkçi həkimlər və tibb tələbələri tərəfindən yoxlanılır. Xəstəxanaya yerləşdirilməsinə ehtiyac olmayan istənilən xəstə üçün yerindəcə resept yazır ki, yaxınlıqdakı xəstəxananın aptekinə gedib onu ala bilər.

Məni müayinə etdikdən sonra xəstəxana jurnalına adımı yazdılar. Sonra məni palatanın müdirinin yanına apardılar daha sonra tibb bacısı məni xəstəxananın kişi şöbəsinə apardı, orada mən yuyunub xəstəxana paltarı geyindim. Sol tərəfdə kitabxana və xəstəxana müdirinin tələbələrə dərs dediyi böyük tədris zalı yerləşir. Bura olduqca işıqlı və təmizdir. Çarpayılar yumşaq, mələfələr ağ Dəməşq parçasından, üstləri isə məxmər kimi zərifdir. Hər otaqda mənbəyə qoşulmuş su borusu var. Bütün otaqlarda peçlər var, gecələr soyuq olanda onu yandırırlar. Demək olar ki, hər gün quş və ya qoyun ətindən yemək verilir, təbii ki, mədəsi belə yeməyə qəbul edə bilənlərə (yəni mədəsində problem olmayan xəstələrə). [Hunke, 1362 h.ş, c.2, s.61]

Dr. Zigrid Hunke bu məktubu qeyd etdikdən sonra yazır:

Yuxarıdakı məktubda 20-ci əsrlə müqayisə oluna bilən bir vəziyyət təsvir edilir, baxmayaraq ki, əslində bu, min il əvvəl İslam ölkələrinin bütün böyük şəhərlərində mövcud olan xəstəxanalardan birinin təsviridir. Himalay və Pireney dağları arasında islam sivilizasiyasının mərkəzləri yerləşirdi. Təkcə Kordova şəhərində 10-cu əsrdə əlli xəstəxana var idi. Harun ər-Rəşidin dövründə Bağdad xəstəxanaları daha da əhəmiyyətli idi. Bu xəstəxanaların yeri hava və su şəraitinə uyğun olaraq diqqətlə seçilirdi. Dəclə suyu bütün xəstəxana otaqlarında borularla axırdı.

Sultan Əzdud-Dövlə Bağdadda yeni və müasir xəstəxana tikmək istəyəndə məşhur həkim cənab Raziyə bu iş üçün ən yaxşı yeri seçməsini göstəriş verdi. Təcrübəli alim olan Razi qoyun əti tikələrini köməkçiləri tərəfindən şəhərin ətrafında müxtəlif yerlərdə asıdırdı, 24 saatdan sonra ət tikələrini bir-biri ilə müqayisə etdi, daha təmiz və təravətli qalan ət olan yerdə Əzdi xəstəxanasını tikdirdi. [Hunke, 1362 h.ş, c.2, s.62]

Vil Durant deyir:

Bu dövrdə İslam ərazisində yaradılmış otuz dörd xəstəxananın adı bizə məlumdur, görünür, hamısı elmi cəhətdən Cündişapur xəstəxanasından bəhrələnmişlər. Haqqında

bildiyimiz ilk xəstəxana Bağdadda Harun ər-Rəşidin dövründə yaradılmışdır. Sonra, 10-cu əsrdə daha beş xəstəxana yaradıldı. 918-ci il hadisələri arasında tarixçilər Bağdad xəstəxanasının müdirindən bəhs edirlər. İslam aləmindəki ən böyük xəstəxanalar 706-cı ildə Dəməşqdə qurulan və 978-ci ildə iyirmi dörd həkimi olan xəstəxana idi. Xəstəxanalar tibb tədrisi üçün ən mühüm yerlər idi. Həkimlik etmək məqsədiylə keçirilən imtahana girib hökumətdən icazə almadan heç kimin həkimlik etmək hüququ yox idi.

Əczaçılar, bərbərlər və sınıqçılar hökumətin təyin etdiyi qayda və qanunlara tabe idi. Müsəlmanlar yaxşı xəstəxanalar yaratmaqda və onların avadanlıqları ilə təmin etməkdə dünyanın qabaqcılları olmuşlar. Nurəddin Mahmudun 1160-cı ildə Dəməşqdə qurduğu xəstəxana bütün xəstələri ödənişsiz müalicə edir və üç əsr ərzində pulsuz dərman verirdi. Tarixçilərin fikrincə, bu xəstəxananın ocağı 267 il ardıcıl olaraq yanıb və heç zaman sönməyib. 1185-ci ildə Bağdada gedən İbn Cübeyr şəhərdəki böyük Əzdi xəstəxanasını (Dəclə sahillərində kral sarayları kimi dayanan və xəstələrə pulsuz yemək və dərman verən xəstəxananı) görəndə təəccüblənir.

Qahirədə Sultan Qəlaon 1285-ci ildə Orta əsrlərin ən böyük xəstəxanası olan Mənsuri xəstəxanasını qurdu. Dörd divarla əhatə olunmuş geniş məkanın içərisində dörd bina yüksəltdi. Onların arasında isə eyvanlarla əhatə olunmuş bir sahə var idi, hovuzlar və su arxları onun havasını sərinləşdirirdi. Burada müxtəlif xəstəliklər üçün ayrıca şöbələr var idi. Burada həmçinin bir neçə laboratoriya, ümumi aptek, ambulatoriyalar üçün poliklinika, bir neçə mətbəx və hamam, kitabxana, ibadət otağı və mühazirə zalı var idi; xüsusən də ruhi xəstələrin, xəstəxanada oluqları hissəsində ürəkaçan mənzələrər var idi. Orada xəstələr, kişi, qadın, varlı, kasıb, azad və qul arasında heç bir fərq olmadan ödənişsiz müalicə olunurdu. Sağalmış xəstələrə xəstəxanadan çıxanda xəstəxanadan bir məbləğ verilirdi ki, onlar bədənləri güclənənə və tam şəkildə sağlamlıqlarını əldə edənə qədər işləməyə ehtiyac duymasınlar. Yuxusuzluqdan əziyyət çəkən xəstələr həzin musiqiyə və peşəkar hekayəçilərə qulaq asar, bəzi hallarda isə tarixi kitablar mütaliə edirdilər. Bütün böyük İslam şəhərlərində ruhi xəstələrin müalicəsi üçün pisxiyatoriya xəstəxanaları var idi.

Burada belə bir sual yaranır bu işlərin büdcəsi haradan təmin edilirdi? Yalnız Mənsur xəstəxanası ildə bir milyon dirhəm tələb edirdi! Xəstəxanaların ixtiyarında büdcələr sona çatmırdımı?

Siqrid Honkenin dilindən bu sualın cavabı:

Bu məbləğ dövlətin dövlət gəlirindən ödənilirdi və adi hal idi ki, hər bir xəstəxananın tikintisi ilə yanaşı, onun xərcləri üçün də kifayət qədər vəqf müəyyən edilirdi.

Bu vəqf torpaqları etibarlı və yüksək rütbəli şəxslər tərəfindən idarə olunurdu, bu insanlara da, hökumət nəzarət edirdi. Xəstəxanaların müdiri adətən əmir və ya zadəganlardan biri idi, inzibati və mühasibat işlərinə nəzarət və rəhbərlik edirdi. Lakin sultan bu təşkilatlara, yəni xəstəxanaya və onun vəqflərinə baş çəkərək, sorğu-sual edərək məlumat əldə edirdi, nəzarət və nəzarət prinsipində təkid edirdi. [İsfəhani, 1384 h.ş, c.1, s.199]

**Dr. Maks Meyerhof**

Müxtəlif yerlərdə Cündişapuru təqlid edərək xəstəxanalar yaradıldı. Bu xəstəxanaların əksəriyyəti İran, Mərakeş, Suriya və Misirdə idi. Qahirədə ilk xəstəxana 872-ci ildə İbn Tulun tərəfindən yaradılmış və 15-ci əsrə qədər qalmışdır. O xəstəxanadan ndan sonra bir neçə başqa xəstəxana yaradılmışdır. Bağdadda ilk xəstəxana 9-cu əsrin əvvəllərində Harun ər-Rəşid tərəfindən tikilib, onuncu əsrdə isə daha beş xəstəxana tikilib. On birinci əsrdə səyyar xəstəxanalar da var idi. Bacarıqlı cərrahlar tələbələr üçün mühazirələr oxuyurdular, onları imtahan edib, sertifikatlar verirdilər, əczaçılar, stomatoloqlar və ümumi həkimlər "Ümumi Səhiyyənin" nəzarəti altında idi. İşə başlamaq istəyən hər bir həkim xüsusi imtahandan keçirilir və onların praktiki məşğələləri üçün şərait yaradılırdı. Hər xəstəxana iki hissəyə bölünürdü. Bir hissəsi qadınların müalicəsi üçün, digər hissəsi isə kişilər üçün

idi və hər birinin yeməkləri və ədviyyatları ayrı və xüsusi idi. Bəzi xəstəxanalarda kitabxana var idi.

**Səyyar xəstəxanalar**

Filip Xuri Hitti yuxarıda qeyd etdiyimiz məlumatdan əlavə olaraq yazır:

Müqtədirin vəziri Saleh bin Əli, Sinana göstəriş vermişdi, həkimlərdən ibarət nümayəndə heyəti, hər yerə lazımi dərmanlarla gedib camaatı müalicə etsinlər, həbsxanalara gündəlik baş çəkməyi də başqa həkimlərə həvalə etmişdi. Bu cür işlər o dövrdə dünyanın başqa yerlərində rast gəlinməyən xalq sağlamlığına müdrik diqqətin əlamətidir. Sənan təbabətin inkişafındakı səylərinə və Bağdaddakı xəstəxananı idarə etməkdə qazandığı uğura görə yüksək ada layiqdir. Bağdad Xəstəxanası Rəşidin 9-cu əsrin əvvəllərində yaratdığı ilk İslam xəstəxanası idi. Çox keçmədi ki, İslam dünyasında 34-ə yaxın xəstəxana yarandı.

Corci Zeydan yazır:

İlk İslam xəstəxanası hicri 88-ci ildə Dəməşqdə Vəlid bin Əbdül-Mülk Əməvinin əmri ilə qurulmuşdur. O həkimləri həmən xəstəxanada işə təyin etdi və dəliləri o xəstəxanaya topladı. Əməvi hökuməti dağılana qədər onların idarəsi üçün büdcə təyin etdi, İslama xas olan yeganə xəstəxana Dəməşqdəki bu xəstəxana idi.

İlk Abbasi xəlifəsi Mənsur Cündişapur xəstəxanasından Bağdada həkimlər gətirdi, lakin o, xəstəxana yaratmadı, o, yalnız korlar və qocalar üçün qocalar evləri açdı, Mənsur və ya onun canişini Bağdadda fsixotiriya xəstəxanası qurdu. Bağdad xəstəxanasının adı başqa şəhərlərdə məşhurlaşan kimi, ən mühüm yerlərdə Bağdadı təqlid edərək xəstəxanalar qurdular. Eyni şəkildə Bağdaddan başqa sivilizasiya vasitələri də götürülürdü.

Üçüncü əsr hələ sona çatmamışdı, Məkkə, Mədinə və digər İslam şəhərlərində xəstəxanalar açıldı. Dördüncü əsrin əvvəllərində Müqtədar Abbasi və nazirləri Bağdad və onun ətrafında xəstəxana tikmək və idarə etmək üçün yarışdılar. Təbii ki, xəstəxanalar eyni zamanda digər İslam ölkələrində də yaradılmışdır: Xorasan, Mosul, Şam, Əndəlus və digər yerləri qeyd etmək olar, ancaq onların hamısını burada qeyd etmirik.

İbn Cübeyr hicri 6-cı əsrdə yazdığı səyahətnamədə gördüyü İslam xəstəxanaları haqqında ətraflı məlumat yazır: O dövrün İslam xəstəxanaları mükəmməl nizam-intizamla işlədilirdi, milliyyətindən, dinindən və peşəsindən asılı olmayaraq, bütün xəstələrə yüksək qayğı ilə yanaşılırdı və hər xəstəliyin öz zalı və ya zalları var idi.

Həkim köməkçiləri və tibb bacıları xəstələri müayinə edib, onlara dərman və yeməklərini müəyyən edirdilər. Sağalan hər bir xəstə evə buraxılırdı. Hər bir xəstə ölürdüsə, kəfən və dəfn xərclərini xəstəxana ödəyirdi, eyni zamanda tibb və əczaçılıq da eyni yerdə tədris olunur, tələbələr elmi dərslərlə yanaşı praktiki məşğələlər keçiriblər.
Müsəlmanlar, səyyar xəstəxanalar yaratmışdılar, dəvələr və qatırlarla ora-bura apardılar. Məsələn, Sultan Mahmud Səlcuqun ordusunda qırx dəvənin çəkdiyi bir xəstəxana var idi, ordu hara getsəydi xəstəxananı da ordu ilə aparardılar. [İsfəhani, 1384 h.ş, c.1, s.202]

Qustav Lebon yuxarıdakı məlumatı biraz fərqli şəkildə yazdıqdan sonra deyir:

Keçmişdə müsəlmanların tikdirdiyi xəstəxanalar sağlamlıq prinsipləri baxımından bizim indiki xəstəxanalarımızdan daha yaxşı idi; çünki onlar çox geniş tikilirdi, yaxşı suyu olardı və hava axını xəstəxanaların içində çox idi. Cənab Raziyə Bağdadda xəstəxana tikmək üçün ən yaxşı məhəlləni seçmək təklif edildikdə, O, qeyd olunan yeri seçmək üçün yeni mikrobioloqlar tərəfindən də qəbul edilən bir üsul seçdi. Razi göstəriş verdi hər məhəllədə bir tikə ət assınlar, sonra baxsınlar ət harada gec iyləyərsə, orada xəstəxana tiksinlər.

Müsəlman xəstəxanalarının indiki xəstəxanalar kimi bir hissəsi xəstələr üçün, digər hissəsi isə tibb təhsili alan tələbələr üçün nəzərdə tutulmuşdu və bu, tələbələrin kitablarda oxuduqlarından daha çox xəstələrin çarpayılarının kənarında olurdular və praktiki təsil görürdülər. Lakin Avropanın orta əsr universitetləri bəziləri istisna olmaqla, tibb təhsilində

bu üsula əməl etmədilər. Müsəlmanlar dəlilik kimi bəzi xəstəliklər üçün xüsusi xəstəxanalar tikdirmişdilər, indi bizdə olduğu kimi, yoxsul xəstələri müəyyən günlərdə pulsuz müalicə edən və onlara qulluq edən xeyriyyə birlikləri var idi və xəstəxana tikmək mümkün olmayan yerlərə dərman və həkim göndərdilər.

Qustav Lebon yenə yazır: mənim əldə etdiyim nəticə budur ki, 10-cu əsrdə müsəlman həkimlər indiki tibbdən çox itki verməyiblər.

### *8.Biologiya və tibb*

Tədricən elm adamları və həkimlərin botanika ilə maraqlanmağa başlaması bir çox bitki haqqında məlumat və izahların artmasına səbəb olmuşdur. Müsəlmanların bitkilərlə də müalilicə etmişlər.

Biologiyanın digər bir mühüm sahəsi olan zoologiyanın isə hazırda baytarlıq elmi adlandıra biləcəyimiz başlanğıcı vardır. Tibbin digər sahələrində olduğu kimi, heyvan xəstəlikləri və onların müalicəsi barəsində bilik sahibi olan yerli həkimlər mövcud idi. İslam dövrünə aid ilk yazılı əsər Əbdülməlik ibn Qüreyb əl-Əsmainin (740-828) əsəridir. Dəvə, at, qoyun, vəhşi heyvanlar və insan vücudu barəsində əsərlər yazmışdır. Onun əsərləri ərəblərin hələ o dövrlərdə insan anatomiyası haqqında nə qədər mühüm məlumatlara sahib olduqlarını göstərir. [Sarton, 1927, c.1, s.534] Baytarlıq elmi çox keçmədən müstəqil bir sahəyə çevrilmişdir. XVI Abbasi xəlifəsi Mütəzidin (ö. 902) cinslik at fermasında atlarının mehtəri olan Əbu Yusif Yaqub ibn Əxi Hizamın (əl-Hüttəli) miniciliklə bağlı əsəri baytarlığın əsasını qoymuşdur.

Dərmanla müalicə sahəsində, meşədə çox təsirli şəfalı bitkilər kəşf edənlərdən, laboratoriyada təcrübə aparanlara qədər çox sayda adları bilinməyən kəşf edənlər yaşamışlar. Onların töhfələri yunan, hind, fars və İslam dövrünün müştərək töhfələri sayılmışdır. Müasir dövrdə Hindistanda tətbiq olunan Yunan tibbi bunun bir nümunəsidir. Bu kəşflər əhəmiyyətli idi. Tibbin farmakologiya sahəsi ilə məşğul olanlar bu kəşfləri toplayaraq cildlərlə əsər nəşr etdirmişdilər.

Bu barədə ən mühüm əsərlərdən birinin yalnız latın dilində tərcüməsi əlimizdədir, ərəb dilindəki orijinalı isə itmişdir. Mətni toplayan özünü Məsuə kimi təqdim edən naməlum bir şəxsdir. Bu əsərdə işlətmə dərmanları üç növə ayrılmışdır. Yumşaldıcı işlədicilər (Hindistan tamarindası, əncir, alça, Çin darçını), yüngül işlədicilər (səna, əzvay, ravənd) və sərt işlədicilər (yalapa, oxyarpaq sarmaşıq, kolosint). [Garrison, 1929, s.133]

İbn Sərabi, Toledolu İbn əl-Vafid və İbn əl-Baytar tədqiqatlarının böyük hissəsini dərmanla müalicəyə həsr etmiş əndəlüslü alimlərdir. Onlar haqqında çox az məlumat var. Həm Serapion Junior kimi tanınan İbn Sərabinin, həm də Toledolu ibn əl-Vəfidin əczaçılıqla bağlı əsəri var. İbn əl-Baytar da baytarlıqla bağlı daha əhatəli bir əsər yazmışdır. Müsəlman İspaniyasında anadan olmuş və Şamda 1248-ci ildə vəfat etmişdir. Həyatının böyük bir hissəsini Yunanıstan, Misir və Anadoluda müalicəvi bitkiləri tədqiq etməyə həsr etmişdir. Həmin ölkələrdən, başqa insanların tədqiqatlarından və öz kəşflərindən öyrəndiklərini müsəlman dünyasında dərman müalicəsinə tətbiq etmişdir. Əsərdə 300-ü həmin dövr üçün yeni olan 1400-ə yaxın dərman təsvir olunmuşdur.

Müsəlmanlar həm də müxtəlif dərman istehsalı metodları kəşf etmişdilər. Həmçinin öz tədqiqatlarını və səyahətlərindəki kəşfləri dərman sahəsinə də tətbiq etmişdilər. Beləliklə, əczaçılığın təməlini qoymuş və dərman hazırlamaqda püxtələşmişdilər. Şərbət, sirop, alkol (bu sözlərin hamısı ərəb mənşəli sözlərdir) və traqakant bunların bəziləridir.

Müsəlman doktorlara tənəffüs yolu ilə istifadəyə yararlı bir anesteziya imkanı yaradan əczaçılıq vasitələrindən biri də "yatızdırıcı süngər"-dir. Bu süngər ağrıya dözümlülük yaradan keyidici maddələrə batırılırdı. Daha sonra qurudulur və istifadə olunurdu. Bu süngər müsəlman cərrahların əməliyyatlarda uğur əldə etmələrində böyük rol oynayırdı. Süngər Qərbdə ilk dəfə Bolonyalı Teodor tərəfindən istifadə olunmuşdur. O da müsəlmanlardan aparmışdır. [Campbell, 1926, c.1, s. 55]

Edvard Braun yunanlardan miras qalan kimya və tibbi avadanlıq sahəsindəki elmi doktrinaya ən böyük töhfəni müsəlmanların verdiyini bildirir. [Arabian Medicine, 1999, s.15-16]

***9.Psixiatriya xəstəxanası***

Avropada bütün sağalmaz xəstələr, xüsusən də ruhi xəstələr bütün orta əsrlər boyu və 18-ci əsrə qədər lənətlənmişdirlər. Avropada ruhi və mənəvi xəstəliklərin müalicəsi, xəstədə olduğuna inanılan pis ruhların çıxarılması idi. Əgər günahsız dəlilər kişi olsaydılar, onlara rəngarəng qadın paltarı geyindirər, üzərinə zəng və heyvan ayaq sümükləri asar, beləliklə onları məhəllə sakinlərinə tanıtardılar. Sonra isə onu öz ixtiyarına buraxır və məhəllənin cahil insanları onları məsxərə edərdilər.

Qədim Yunanıstanda zehni xəstələr ailələrinə verilirdi və ailə, xəstədən heç kimə zərər verməyəcəyinə dair söz verməli idi, ancaq İslam ölkələrində ruhi xəstələr qorunur və nevrologiya şöbəsində müalicə olunurdular, məsələn, Bağdad və Qahirədə nevroloji şöbədəki ruhi xəstələr müvafiq həkim nəzarəti altında idi və bütün xəstəxana Sultanın özünün həftəlik nəzarəti altında idi.

On doqquzuncu əsrdə Avropada ruhi xəstələr həbsxanaya salınaraq polisin nəzarəti altında saxlanılırdı və onlara cinayətkar kimi yanaşırdılar. Avropada yalnız İspaniyada İslam hökmranlığı dəvründən bəri ruhi xəstələr üçün "günahsızlar" adlı xəstəxanalar var idi. 1751-ci ildə İngiltərə ruhi xəstələrə baxmaq üçün İslam sivilizasiya sistemini təqlid edərək ilk addımı atdı. [İsfəhani, 1384 h.ş, c.1, s.197]

***10.Əczaçılıq***

Ticarət məqsədilə ilk dəfə IX əsrdə açılan əczaxanalar qısa müddətdə müsəlman dünyasının hər tərəfində fəaliyyət göstərmişdir. Artıq müsəlman cəmiyyəti və həkimlər bütün müsəlman dünyasından toplanaraq bir yerə gətirilən dərmanları ala bilirdilər. Müasir dövrdə Qərbdə həblərin üstünə şəkərlə təbəqə çəkmə geniş yayılmış bir üsuldur. Lakin müsəlmanlar o dövrdə gül suyu və ekstraktı istifadə edirdilər. Əczaçılar mütəxəssis və icazəli idilər, mağazaları isə daim təftiş olunurdu.

Tibbi müalicə ilə əczaçılıq arasında heç bir fərq yox idi. Çünki dərman hazırlamaqla bağlı təhsil də tibb təhsilinin vacib şərtlərindən biri idi. Bir çox həkim həmkarlarının istifadə edə bilməsi üçün dərmanla müalicənin təfsilatını yazmışdır. Nəticədə kimya və botanika farmakologiya sahəsinə yaxın sahələr hesab olunmuşdur. Bir çox tanınmış həkim yeni dərmanlar düzəltmişdir.

Kindi həm də əczaçılıqla bağlı tədqiqatlar aparmışdır. Farmakologiyanı yaxşı bilən alimlərdən biri də X əsrdə yaşayan və Herat hökmdarının özəl həkimliyini etmiş Əbu Mənsur Müvəffəqdir. "Dərmanların həqiqi xüsusiyyətləri" adlı əsəri yunan, hind, süryani və müsəlman mənbələrdən toplanan əczaçılıq biliklərini bir yerə cəmləşdirmişdir. 970-ci ildə yazılmış bu sistematik tədqiqatda bitkilərdən, minerallardan və heyvanlardan alınan 585 dərman təsirlərinə görə dörd sinifə bölünmüşdür. Müvəffəq həm də ümumi farmakologiya nəzəriyyəsinə bir tərif əlavə etmişdir. Əsərində daha sonra "Paris plasteri" kimi tanınan gipsin hazırlanması və istifadəsindən bəhs etmişdir. Əsər, həm də müasir fars mədəniyyətinin ilk elmi tədqiqatı sayılır. [Sarton, 1927, c.1, s.678] Müvəffəqin müasiri fələstinli həkim Təmimi dərmanlarla təcrübələr aparmış, əczaçılıqla əlaqəli bir çox əsər yazmış və qidaların insan sağlamlığına təsiri haqqında fikir bildirmişdir. O dövrdə Tunisin əl-Qeyrəvan bölgəsində yaşayan İbn Cəzzar (898-980) "Səyyahın ərzaqı" adlı kitabı ilə məşhur olmuşdur. Səyahətə çıxanlara çox faydası olan və çox böyük tələbat olan bu kitabda səfərdə olanlara hər cür xəstəlikdən bəhs edilmiş və müalicə yolları təklif olunmuşdur. Xüsusilə də (Misirdəki vəbanın səbəbləri daxil olmaqla) yoluxucu xəstəliklər haqqında geniş, əhatəli məlumat verilməsi böyük əhəmiyyət daşıyır. Kitabın ən mühüm xüsusiyyətlərindən biri də ətraf mühit və iqlim dəyişikliklərinin səbəbləri haqqında məlumat verməsidir. Məsələn, aqrar bölgələrdən Məkkəyə gedən hacılar həyatlarını

dözülməz hala gətirən bir narahatlıqla qarşı-qarşıya qalırdılar. Məkkənin quru havası burun boşluğundakı mukoza təbəqəsinin şişməsinə səbəb olurdu.

Həmin dövrün bir digər məşhur farmakoloqu, elmi fəaliyyətini Bağdadda aparan Masəveyh əl-Mardinidir (ö. 1015). O, ölümünə qədər Misirdə Fatimi xəlifəsi əl-Hakimin özəl həkimi olmuşdur. Peşə həyatının böyük hissəsini İslami tibb araşdırmalarına həsr etmişdir. Əvvəlcə işlədici və qusdurucu dərmanlarla əlaqəli bir əsər yazmış, daha sonra isə öz dövründə bilinən hər xəstəlik üçün bir dərman müalicəsi tövsiyə edən əsər yazmışdır. Ən mühüm əsəri tibb dünyasında çox müsbət reaksiyaya səbəb olan və əsrlər boyu Qərbdə farmakologiya sahəsində standart dərs kitabı olaraq qalan on iki fəsillik kodeksidir. [Sarton, 1927, c.1, s.728]

Simon Set də eyni dövrdə Bizansda yaşayan bir yəhudi həkimdir və müsəlmanların tibb və əczaçılıq sahəsində göstərdikləri inkişafı nümunə göstərir. Seth müsəlman alimlərin latın dilindən ərəb dilinə tərcümə ənənəsini əksinə çevirənlərdən biridir. Ərəb dilindən latın dilinə tərcümələr etmiş və müsəlman dünyasındakı dərmanlara üstünlük vermişdir. İlk mühüm əsəri müəyyən qidaların (çoxu müsəlman dünyasına, bəziləri də Hindistana aid) müalicəvi xüsusiyyətindən bəhs edən bir lüğətdir. Bu əsərdə ərəb dilindəki sözləri yunan dilinə uyğunlaşdırmışdır. Bu sözlərdən həm də Qərbdə latın dilindəki tərcümələrdə istifadə olunmuşdur. Məsələn, kafur, (camphor) müşk, ənbər, şərbət, (julep) syrup. "Bu əsərdə qeyd olunan dərman və ədviyyatların hamısı olmasa da, bir qismi yunan dilində ilk dəfə qarşımıza çıxır". [Sarton, 1927, c.1, s.728] Seth botanika lüğəti də hazırlamışdır. Belə məlum olur ki, botanika tibdən ayrılmış və müstəqil bir elm sahəsinə çevrilməyə başlamışdır. Müəllifi Kordovalı əl-Bəkrinin (1014-1094) olduğu güman edilən müsəlman İspaniyasının bitkiləri və ağacları haqqında da kitab mövcuddur.

Ustadlardan elm öyrənmək məqsədilə müxtəlif elm ocaqlarını gəzən alimlər sayəsində tibb və əczaçılıq elmi İslam dünyasına yayılmışdır. Bir yerdə doğulub başqa bir yerdə tibb öyrənərək tətbiq etməyə başlayan və sonra başqa bölgələrdə məskunlaşaraq həyatını davam etdirən çox bacarıqlı həkimlər vardı. Bəziləri həmkarlarına daha çox məlumat ötürə bilmək və iş həyatlarında onlara dəstək olmaq üçün kitablar yazmışdılar. Məsələn, Masəveyh əl-Mardini yuxarı Mesopotamiyada anadan olmuş, Bağdadda işləmiş və daha sonra Misirdə Fatimi xəlifəsi Həkəmin özəl həkimi olmuşdur. İşlədici və qusdurucu dərmanlarla əlaqəli kitab yazmışdır. Lakin həmin dövrün ən məşhur əsəri müsəlmanların o dövrdə əczaçılıq sahəsindəki bütün elmi mirasını ehtiva edən ensiklopediyalar idi. Həmin ensiklopediyalar İslam dünyasında böyük maraqla qarşılanmış və əsrlər boyu Qərbdə dərs kitabı kimi oxudulmuşdur. [Sarton, 1927, c.1, s.729]

Misirdə yaşayan başqa bir həkim isə Əmmar ibn Əli əl-Mövsilidir (ö. 1010). Mühüm icadları ilə məşhurlaşmışdır. Sartona görə, "müsəlmanlar göz həkimlərinin ən böyüyü"-dür. Göz, göz xəstəlikləri və müalicəsi haqqında yazdığı əsəri həm də cərrahi əməliyyatlar haqqındadır. Kitabın bir fəslində "bir nəfərdə yumşaq katarakt təbəqəsinin absorbsiya vasitəsilə müalicə etdiyi altı mərhələli katarakt əməliyyatı" nəql edilmişdir. Əmmarın uğurlu töhfəsini ondan da məşhur olan Əli ibn İsa davam etdirmişdir. [İsa & Əli, 2020, s.171-177]

Bir digər göz həkimi isə farsca əsər yazan İbn Mənsur əl-Yəmənidir. Uğuru ona verilən "Zərrin dəst" (qızıl əl) adından da məlumdur. Tibb sahəsinə ən böyük töhfəsi aftalmologiya sahəsində yazdığı "Nurül-uyun" adlı əsəridir.

Vil Durant məşhur tarixçi deyir:

İtaliya və Yaxın Şərq arasındakı vacib ticarətimizdən biri, İslam dərmanlarının idxalı idi. İlk dəfə aptek müsəlmanlar tərəfindən yaradıldı, onlar ilk farmakologiya məktəbini qurdular, təbiətşünaslıq, farmakologiya və əczaçılıq elmlərində müxtəlif əhəmiyyətli kitablar yazdılar. [Durant, c.11]

Filip Xuri "Ərəb tarixi" kitabında yazır:

Müsəlmanlar arasında təbabətdən istifadə o dövrlərdə çox inkişaf etmişdi. Müsəlmanlar ilk apteklər açan insanlardır. Onlar ən qədim əczaçılıq məktəbini qurdular. Həmçinin, o, dərmanların necə birləşməsinə dair ilk kitab yazdılar və dərmanların tərkibi haqqında çoxlu məqalələr təlif etdilər.

Corc Zidan bununla bağlı yazır:

Əczaçılıq təbabətin bir sahəsidir. Müsəlmanlar bu sahədə çoxlu xidmətlər göstərmiş, Hindistandan və başqa yerlərdən çoxlu dərman bitkiləri toplamışlar. Bu hərəkət ilk dəfə Yəhya bin Xalid Bərməkinin dövründə həyata keçirilmiş, sonralar müsəlmanlar arasından dahi əczaçılar və həkimlər yetişərək hind və yunan dillərindən botanika və əczaçılıq kitablarını tərcümə etmiş, əczaçılıqla bağlı kitablar yazmışlar. Tibb sahəsində araşdırma aparan avropalı alimlər müəyyən etmişlər ki, müsəlmanlar bu elmin baniləridir. İlk dəfə əczaçılıqla məşğul olan və yeni dərmanlar tapan müsəlmanlar olmuşlar.

Onlar günümzdəki kimi aptek açan ilk insanlardır. Bunun sübutu odur ki, indiyə qədər fərənglilərin bəzi dərman və bitki adları müsəlmanların qoyduğu ərəb, hind və ya fars adları ilə eynidir. Təbii ki, onların əczaçılıq elmindəki irəliləyişləri kimya və botanikada irəliləyişləri sayəsində olub və heç bir şübhə yoxdur ki, müsəlmanlar öz təcrübələri ilə yeni kimya elminin əsasını qoyublar. Xalid bin Yezid ilk dəfə kimya kitabını İsgəndəriyyə məktəbindən götürərək ərəb dilinə tərcümə etdi. Sonra Cabir bin Həyyan, ondan sonra Kendi, ondan sonra Əbu Bəkr Razi və başqaları həmin elmi inkişaf etdirdilər və bir çox kimyəvi birləşmələr kəşf etdilər, həmin kəşflər əsasında yeni kimya yarandı.

Dr. Sigrid Hunke yazır:

İslam ölkələrinin xəstəxanalarında hər bir həkimin yeni dərmanı sınaqdan keçirməsi mümkün idi. Dərman sınaqdan keçirən həkim, təcrübəsinin nəticəsini xüsusi dəftərdə şərh etməli və öz nəzərini bildirməli idi, sonradan "sınaqdan keçmiş dərman" kimi istehsal olunsun və tibb aləminə daxil olsun. Bu yolla qəhvə, kafur, kəbabə, kitre, dəvətikanı, Hind qozu, ənbər və bir çox başqa dərmanlar İslam təbabəti xəzinəsinə daxil olmuş və sonradan Avropaya yol tapmışdır. O vaxta qədər heç kimin diqqət etmədiyi bitkilər, ilk dəfə tibbi dərman kimi istifadə olundu və bəzi bitkilər üçün yeni istifadələr kəşf edildi. Bu yolla ilk dəfə müsəlman həkimləri ürək xəstəlikləri üçün qəhvədən, dizenteriya və ağır yaralanmalarda isə üyüdülmüş qəhvədən istifadə etmişlər. Ürəyi canlandırmaq üçün kafurdan, parazitləri dəf etmək üçün isə kəbabədən istifadə etmişlər.

Yunan həkimlərinin yüz illər boyu qusma və ishal üçün təyin etdiyi pis dadlı dərmanların əvəzinə, Massəviyə və Razi səna yarpağı, Hindistan tamarindası yazırdılar. Eyni zamanda digər bitkilərdən də dərmanın danını dəyişmək üçün istifadə edirdilər.

Dərman düsturlarının bir kitabda toplanması İslam alimlərindən qaynaqlanır. Onların yazdıqları kitablar əsasında, əczaçılar 17-ci əsrə qədər dərmanlarını onların əsasında hazırlayırdılar. Uzun müddət müsəlmanlar arasında yayılmış dərmanlar ticarət yolu ilə Avropaya aparılırdı. Müsəlmanların idarə etdiyi Siciliyanın yaxınlığı Afrikalı Konstantinin İslam tibbi kitablarının tam tərcüməsi ilə Avropa apteklərinə yeni nəfəs verdi. Onun şüası Almaniyadakı Reyn çayına və Hildegard fon Bingenin yazılarına çatdı. Müsəlmanların Avropa əczaçılarına bilavasitə elmi təsiri humanist eranın və İntibah dövrünün sonuna qədər qaldı və 19-cu əsrə qədər də ona təsir etdi. 1758-ci ildə İbn əl-Bəytarın əczaçılıq elminin bəzi hissələri yenidən nəşr olundu. Bu gün də hər bir xəstəxana, istər kimya laboratoriyası, istər aptek, istərsə də hər hansı bitki tərkibli dərmanlar olan müəssisə, bütün təşkilati vasitələri ilə İslam sivilizasiyasının əhəmiyyətinin canlı və hiss olunan heykəlidir. Demək olar ki, hər üzəri örtülmüş tablet, avropalıların iki böyük İslam həkimi və iki müəllimi Əl-Zəhravi və Zəkəriyyə Razi, İbn Sina və İbn Bəytarın kiçik xatirəsidir. [Dəşti, 1399 h.ş, 88]

Dr. Maks Meyerhof yazır:

Bu dövrdə bir neçə kitab farmakologiya haqqında yazılmış və bu mövzunun ən məşhur müəllifi İbn əl-Bəyar olmuşdur. Bu böyük insan İspaniyadan Suriyaya qədər Aralıq dənizi

sahillərinin bütün bitki və dərmanlarını toplayıb və 1400-dən çox dərmanı izah etmişdir. Bundan əlavə, o, sözügedən dərmanları 150-dən çox qədim və ərəb yazıçısının izahları ilə müqayisə edib.Dərmanlar haqqında toplum olan bu əsər ən qeyri-adi əsərlərdən biridir və ən böyük ərəb botanika kitabı hesab olunur. Bundan sonra İslam dünyasında indi də istifadə olunan mürəkkəb dərmanlar haqqında ərəbcə kitablar yazılmışdır.

Qustav Lebon yazır:

Müsəlmanların tibb elmində ən mühüm nailiyyətləri cərrahiyyə və xəstəliklərin və dərman növlərinin izahı və əczaçılıq texnologiyası sahəsində olmuşdur. Əsrlər boyu tərk edilmiş xəstəliklərin müalicəsi üsullarını inkişaf etdirdilər. Yenə tibb elmi eyni üsullardan istifadə edir, məsələn: tif xəstəliyinin müalicəsində soyuq suyun istifadəsi kimi. Müsəlmanların, bitkilərin xüsusiyyətlərini qeyd etməsiylə, məsələn: borucuqlu kassiya, səna, Hindistan tamarindası, qarğabükən, kafur, sipirt və digərlərinin xüsusiyyətlərini qeyd etməsiylə tibb elmi müsəlmanlara borcludurlar. Həmçinin, indiyə qədər aramızda geniş yayılmış bir çox ədviyə, məcun, hər cür şərbət və həlimlərin, məlhəmlər, yağlar və s.-nin birləşməsində onların çoxlu xidmətləri olub. Bəzi hallarda, xəstəliklərin müalicəsində adət olunan və istifadə edilən üsullar olub ki, indi, tərk edilmiş illərdən sonra yeni kəşflər adı ilə yenidən istifadə olunur.

Həmçinin bəzi bitkilər və ağaclar xüsusi dərmanlarda isladılırdı ki, o dərmanın xüsusiyyətini özünə cəzb etsin. Məsələn, İbn Zəhravi qəbizlikdən əziyyət çəkən xəstələrini, dərmanların tərkibini özündə cəzb edən üzümlə müalicə edirdi. [İsfəhani, 1384 h.ş, c.1, s.207]

### *11.Nəticə*

İslam dininin elm və təhsil üçün əhəmiyyəti səbəb oldu ki, qısa müddət ərzində müxtəlif elmi sahələrdə, o cümlədən ilahi elm, fəlsəfə, tibb, səhiyyə, coğrafiya, fizika, kimya və digər sahələrdə çoxlu kitablar yazıldı və tərcümə oldu. Onun bir hissəsi tərcümə, digər hissəsi isə İslam alimlərinin müxtəlif elmi sahələrdə yeni araşdırmaları şəklində nəşr edilmişdir. İslam sivilizasiyasının tarixini müzakirə edən və ya kitablar yazan alimlər, Qərb alimləri, İslam sivilizasiyası tarixinin mühüm bir fəslini, müsəlmanların elmi hərəkatına həsr etmişdir. Hər elm və texnikanın alimlərinin adlarını çəkməklə müxtəlif elm sahələrini (müsəlmanların nəzarəti altında inkişaf edən və genişlənən) sadalamışlar.

Qərb tarixçilərinin açıq etirafına görə, Avropanın elmi hərəkatı müsəlmanların elmi hərəkatından ilhamlanmışdır və avropalılar elmi hərəkatlarında İslam alimlərinə borcludurlar!

## *ƏDƏBİYYAT SİYAHISI*

**1.** *Qurani-Kərim*.
**2.** Hunke, Z. (1362 hicri-şəmsi). *Allahs sonne über dem Abendland [Avropadakı İslam Mədəniyyəti]* (M. Rəhbani, Trans.).
**3.** Hunke, Z. (1362 hicri-şəmsi). *Allahs sonne über dem Abendland [Avropadakı İslam Mədəniyyəti]* (M. Rəhbani, Trans., Vol. 2).
**4.** Campbell, D. (1926). *Arabian Medicine and Its Influence on the middle Ages*. London: Kegan Paul.
**5.** Garrison, F. H. (1929). *An Introduction to the History of Medicine*. Philadelphia, PA & London: W.B. Saunders.
**6.** Tumanyas (1336 hicri-şəmsi). *Behdaşt dər dine İslam* [İslam dinində gigiyena]. (H. Ə. Xuruş, Trans.). İsfahan: Bongahe Mətbuatiye Mutəhhir.
**7.** Məclisi, M. B. (1404 h.q.). *Biharul ənvar*. Beyrut: Müəssiseyi əlvəfa.
**8.** Əyyan, B. (1362 hicri-şəmsi). *Elm və din* (B. Xürrəmşahi, Trans.). Tehran: Nəşri Daneşgahi.
**9.** İsfəhani, Ə. (1384 hicri-şəmsi). *Etirafat (Xədəmate İslam be Orupa)*. Tehran: İntişarate Həzrət Əbbas (ə).

**10.** *Etirafate daneşməndane bozorge cəhan*. (1402 hicri-qəməri). Tehran: İntişarate Ayine Cəfəri.
**11.** Zərkeli, X. (2002). *Əl-Əlaam*. Beyrut: Darul Elm lil-Məllayin.
**12.** əl-Əmin, M. (1403 h.q.). *Əyanüş-şiə*. Beyrut.
**13.** Kuleyni, M. ibn Y. (1407 h.q.). *Əl-Kafi*. Tehran: Darul-Kutubul İslami.
**14.** Hunke, Z. (1376 hicri-şəmsi). *Fərhənge İslam dər Orupa* (M. Rəhbani, Trans.). Tehran: Dəftəre Nəşr Fərhənge İslami.
**15.** Bədvi, Ə. (1375 hicri-şəmsi). *Fərhənge kamile xavərşenasan* (Ş. Xakrənd, Trans.). Qum: Mərkəze Mutaliat və Təhqiqate İslami Dəftəre Təbliğate İslami.
**16.** Xurşid, Ə., & Səidi, S. Ğ. (1347 hicri-şəmsi). *İslam və Ğərb*. Qum: İntişarate Daru əl-Təbliğ İslami.
**17.** Aslanova, R. (2002). *İslam və Mədəniyyət*. Bakı: Azərbaycan Universiteti Nəşriyyatı.
**18.** Nikbin, N. (n.d.). *İslam əz didgahe daneşməndane Ğərb*. Tehran: Şirkəte Simane Fars.
**19.** Korbin, H. (1986). *İslam felsefesi tarihi* (H. Hatemi, Trans.). İstanbul.
**20.** Lewis, I. M. (1966). *Islam in Tropical Africa*. Oxford, UK: Oxford University Press.
**21.** Həsənli, S. (1998). *İslam mədəniyyətində elm*. Bakı: Elm və Həyat Nəşriyyatı.
**22.** Kraçkovski, İ. Yu. *İbn Fədlanın Volqaya səyahəti*. SSRİ Elmlər Akademiyasının Nəşriyyatı.
**23.** Sarton, G. (1927). *Introduction to the History of Science, From Homer to Omer Khayyam*. Baltimore, Washington, DC: Carnegie Institution of Washington.
**24.** Dölen, E. (2002). *Kimya, Türkiye Diyanet Vakfi İslâm Ansiklopedisi*. İstanbul: TDV Yayınları.
**25.** Bammat, H. (1994). *Qərb mədəniyyətinin inkişafında müsəlmanların rolu*. Bakı: Azərbaycan Dövlət Nəşriyyatı.
**26.** Əlveri, M. (1381 hicri-şəmsi). *Mutaliate İslami dər Ğərb*. Tehran: Simət.
**27.** Səmimi, M., & Mehrpuya, Ə. (1382 hicri-şəmsi). *Muhəmməd dər Orupa*. Tehran: İntişarate İttilaat.
**28.** Walker, T., & Guillaume, A. (1325 hicri-şəmsi). *Mirase İslam* (M. Elm, Trans.). Tehran: Ktabforuşiye Mehr.
**29.** İsa, Ə., & Əli, O. (2020). *Müsəlmanların İntibaha tövhəsi*. Bakı: “İdrak” İctimai Birliyi.
**30.** Hedli, L. (1321 hicri-şəmsi). *Nedaye İslam dər Ğərb* (Ə. Hilaliyan, Trans.). Tehran: Kitabforuşiye Hafiz.
**31.** Markus, M. (1348 hicri-şəmsi). *Nəqşe İslam dər brabəre Ğərb* (S. Q. Səidi, Trans.). Qum: İntişarate Daru əl-Təbliğe İslamiye.
**32.** Davenport, J. (1348 hicri-şəmsi). *Ozre təqsir be pişgah Muhəmməd və Quran* (Səidi, Q. Trans.). Qum: Mərkəze İntişarate Daru əl-Təbliğ İslami.
**33.** Ceydan, C. (1356 hicri-şəmsi). *Tarixe təməddone İslami* (Ə. Cəvahir Kəlam, Trans.). Tehran: Mussiseye Əmir Kəbir.
**34.** Fəxrdai, M. (1382 hicri-şəmsi). *Tarixe təməddone İslam və Ğərb*. Tehran: Dünyaye Kitab.
**35.** Hitti, F. X. (1344 hicri-şəmsi). *Tarixe Ərəb* (Ə. Payənde, Trans.). Təbriz: Kitabxaneye Muhəmmədbaqir Həqiqət.
**36.** Vat, M. (1378 hicri-şəmsi). *Təsire İslam bər Orupaye qorune vusta* (H. Əbdulmuhəmmədi, Trans.). Qum: Muəssiseye Amuzeşiye və Pejuheşiye İmam Xumeyni.
**37.** Mustəğfəri, C. ibn Məhəmməd (1385 hicri-qəməri). *Tibbun-Nəbiy (s)*. Nəcəf: Məktəbətu əl-Heydəriyyə.
**38.** Keyhan qəzeti. (1355). Aban, No. 139998.
**39.** Heyət, C. (2010, March 19). İslam mədəniyyətinin Qərb mədəniyyətinin inkişafına təsiri. *525-ci qəzet*, p. 7.

**40.** *Arabian Medicine* (1999), pp. 15-16.
**41.** Durant, V. J. (n.d.) *Sivilizasiya tarixi*, Vol. 11.
**42.** Dəşti, R. (1399 h.ş.). *Məcəlleye tarixe pezeşki*, No. 43, p. 88.

## *REFERENCES*

**1.** The Quran. (in Arabic)
**2.** Hunke, Z. (1362 AH). *Allah's Sun over the Occident [Islamic Culture in Europe]* (Trans. M. Rahbani). (in Persian)
**3.** Hunke, Z. (1362 AH). *Allah's Sun over the Occident [Islamic Culture in Europe]* (Trans. M. Rahbani, Vol. 2). (in Persian)
**4.** Campbell, D. (1926). *Arabian Medicine and Its Influence on the Middle Ages.* London: Kegan Paul. (in English)
**5.** Garrison, F. H. (1929). *An Introduction to the History of Medicine.* Philadelphia, PA & London: W.B. Saunders. (in English)
**6.** Tumanyas. (1336 AH). *Behdasht dar din-e Islam* [Health in Islam]. (Trans. H. A. Khurush). Isfahan: Muttahhir Publishing House. (in Persian)
**7.** Majlisi, M. B. (1404 AH). *Bihar al-Anwar.* Beirut: Al-Wafa Institute. (in Arabic)
**8.** Ayyan, B. (1362 AH). *Elm va din* [Science and Religion]. (Trans. B. Khorramshahi). Tehran: University Press. (in Persian)
**9.** Isfahani, A. (1384 AH). *Eterafaat* [Confessions]. *(The Contributions of Islam to Europe).* Tehran: Intisharat Hazrat Abbas. (in Persian)
**10.** *Etirafate daneşməndane bozorge cəhan* [Confessions of Great Scholars]. (1402 AH). Tehran: Ayineh Jafari Publications. (in Persian)
**11.** Zarkali, K. (2002). *Al-Alam.* Beirut: Dar Al-Ilm Lilmalayin. (in Arabic)
**12.** Al-Amin, M. (1403 AH). *Ayan al-Shi'a* [The Eminent Shiites]. Beirut. (in Arabic)
**13.** Kulayni, M. ibn Ya'qub. (1407 AH). *Al-Kafi.* Tehran: Dar al-Kutub al-Islami. (in Arabic)
**14.** Hunke, Z. (1376 AH). *Farhang-e Islam dar Uropa* [Islamic Culture in Europe]. (Trans. M. Rahbani). Tehran: Office of Islamic Culture Publications. (in Persian)
**15.** Badawi, A. (1375 AH). *Farhang-e kamil-e khavarshenasan* [Comprehensive Encyclopedia of Orientalists]. (Trans. Sh. Khakrand). Qom: Islamic Studies and Research Center of the Islamic Propaganda Office. (in Persian)
**16.** Khurshid, A., & Saidi, S. Q. (1347 AH). *Islam va Gharb* [Islam and the West]. Qom: Islamic Propagation Institute Publications. (in Persian)
**17.** Aslanova, R. (2002). *Islam and Culture.* Baku: Azerbaijan University Press. (in Azerbaijani)
**18.** Nikbin, N. (n.d.). *Islam az didgah-e daneshmandane Gharb* [Islam from the Perspective of Western Scholars]. Tehran: Fars Sima Company. (in Persian)
**19.** Corbin, H. (1986). *Islam felsefesi tarihi* [History of Islamic Philosophy]. (Trans. H. Hatemi). Istanbul. (in Turkish)
**20.** Lewis, I. M. (1966). *Islam in Tropical Africa.* Oxford, UK: Oxford University Press. (in English)
**21.** Hasanli, S. (1998). *Science in Islamic Culture.* Baku: Elm va Hayat Publishing. (in Azerbaijani)
**22.** Krachkovski, I. Yu. *The Journey of Ibn Fadlan to the Volga.* USSR Academy of Sciences Publishing. (in Russian)
**23.** Sarton, G. (1927). *Introduction to the History of Science, From Homer to Omar Khayyam.* Baltimore, Washington, DC: Carnegie Institution of Washington. (in English)
**24.** Dolen, E. (2002). *Chemistry,* in *Turkish Diyanet Foundation Encyclopedia of Islam.* Istanbul: TDV Publications. (in Turkish)

**25.** Bammat, H. (1994). *The Role of Muslims in the Development of Western Culture.* Baku: Azerbaijan State Publishing House. (in Azerbaijani)
**26.** Alveri, M. (1381 AH). *Mutaliat-e Islami dar Gharb* [Islamic Studies in the West]. Tehran: Simat. (in Persian)
**27.** Samimi, M., & Mehrpuya, A. (1382 AH). *Muhammad dar Uropa* [Muhammad in Europe]. Tehran: Ettela'at Publishing. (in Persian)
**28.** Walker, T., & Guillaume, A. (1325 AH). *Miras-e Islam* [The Legacy of Islam]. (Trans. M. Elm). Tehran: Mehr Bookstore. (in Persian)
**29.** Isa, A., & Ali, O. (2020). *The Contribution of Muslims to the Renaissance.* Baku: "Idrak" Public Union. (in Azerbaijani)
**30.** Hedli, L. (1321 AH). *Neda-ye Islam dar Gharb* [The Call of Islam in the West]. (Trans. A. Hilalian). Tehran: Hafez Bookstore. (in Persian)
**31.** Marcus, M. (1348 AH). *Naqsh-e Islam dar barabar-e Gharb* [The Role of Islam in Confronting the West]. (Trans. S. Q. Saidi). Qom: Islamic Propagation Institute Publications. (in Persian)
**32.** Davenport, J. (1348 AH). *Uzr-e taqsir be pishgah-e Muhammad va Quran* [An Apology to Muhammad and the Quran] (Trans. S. Gholamreza). Qom: Center for Islamic Propagation Publications. (in Persian)
**33.** Jeydan, J. (1356 AH). *Tarikh-e tamaddon-e Islami* [History of Islamic Civilization]. (Trans. A. Javaher Kalam). Tehran: Amir Kabir Institute. (in Persian)
**34.** Fakhrdai, M. (1382 AH). *Tarikh-e tamaddon-e Islam va Gharb* [History of Islamic Civilization and the West]. Tehran: The World of Books. (in Persian)
**35.** Hitti, F. X. (1344 AH). *Tarikhe Arab* [History of the Arabs] (Trans. A. Payande). Tabriz: Muhammadbaqir Haghighat Library. (in Persian)
**36.** Watt, M. (1378 AH). *Tesire Islam bar Orupaye qorune vusta* [The Influence of Islam on Medieval Europe]. (Trans. H. Abdulmuhammadi). Qom: Imam Khomeini Educational and Research Institute. (in Persian)
**37.** Mustaghfari, J. ibn Mahammad (1385 AH). *Tibbun-Nabiy (PBUH)* [The Medicine of the Prophet (PBUH)]. Najaf: Al-Haydariyah Bookstore. (in Arabic)
**38.** *Keyhan Newspaper*. (1976). Aban, No. 139998. (in Persian)
**39.** Heyat, J. (2010, March 19). The Influence of Islamic Culture on the Development of Western Culture. *525th Newspaper*. (in Azerbaijani)
**40.** *Arabian Medicine*. (1999), pp. 15-16. (in English)
**41.** Durant, V. J. (n.d.) *History of Civilization*, Vol. 11. (in English)
**42.** Dashti, R. (2020). *Journal of the History of Medicine*, No. 43, p. 88. (in Persian)